# Azərbaycanda Buğda Genotiplərində Gövdə Pasının TKTTF Ras Qrupuna Effektiv Davamlı *Sr11, Sr26* və *Sr31* Genlərinin İdentifikasiyası

**S.M. Rüstəmova, A.T. Hacıyeva, Ş.F. Sadıqov, Ə.Ç. Məmmədov, İ.M. Hüseynova***

*AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu, Mətbuat prospekti, 2A, Bakı AZ1073, Azərbaycan; *E-mail: i_guseinova@mail.ru*

**İlk dəfə olaraq KASP (Kompetitive Allele Specific PCR) genotipləşdirmə texnologiyası tətbiq olunmaqla buğdanın rüşeym plazması yoxlanılmış və gövdə pasının Azərbaycanda yayılan TKTTF ras qrupuna effektiv davamlı gen mənbələri xarakterizə edilmişdir. Diallel tipli KASP_6BL_BS0074288_51 praymeri ilə aparılan Real zamanda gedən PZR (RT-PZR) analizləri nəticəsində 34 buğda genotipindən 9-nun, KASp_6BL_Tdurum contig55744_822 praymeri ilə 10 genotipdən 7-nin 6B xromosomunda *Sr11* geni identifikasiya edilmişdir. Dominant STS marker Sr26#43 ilə aparılan PZR nəticəsində 42 buğda genotipindən 11-də *Sr26* geni üçün diaqnostik amplikon hesab olunan 207 bp uzunluğunda fraqment sintez olunmuşdur. 42 buğda genotipinin 1BL.1RS translokasiyasında yerləşən Lr26-Sr31-Yr9 lokusun spesifik İag95 praymeri ilə analizi zamanı 8 genotipdə *Sr31* geni üçün xarakterik 1100 bp uzunluğunda DNT fraqmentin sintezi müəyyən edilmişdir.**

***Açar sözlər:*** *Buğda, Puccinia graminis f. sp. tritici, Sr11, Sr26, Sr31, KASP-genotipləşdirmə, RT-PZR*

## GİRİŞ

Dənli bitkilərin pas xəstəlikləri dünyanın bir çox ölkələrində olduğu kimi, Azərbaycanda da kifayət dərəcədə təhlükəli xəstəlik hesab olunur. Bunlardan biri də *Puccinia graminis* Pers. f. sp. *tritici* tərəfindən törədilən gövdə pası xəstəliyidir. Gövdə pası əkinlərə dağıdıcı təsir göstərən ən təhlükəli xəstəlik hesab olunur (Singh et al., 2008; Yu et al., 2017). İlk dəfə gövdə pası xəstəliyi Azərbaycanda 1927-ci ildə müşahidə edilmiş və 1975-ci ilə qədər geniş yayılmışdır. 1979-cu ildən uzun müddət ərzində bu xəstəliyin depressiyaya uğramasına baxmayaraq, 2013-cü ildə yenidən İCARDA-dan introduksiya edilmiş 11thRWKLDN-CWAC-12 yumşaq buğda sortunda vegetasiyanın sonunda 20-30S səviyyəsində gövdə pası müşahidə edilmişdir. 2014-2015-ci illərdə isə artıq Azərbaycanın müxtəlif bölgələrində, o cümlədən Gəncə-Qazax bölgəsinin Samux rayonu ərazisində, Tərtər Bölgə Təcrübə Stansiyasında, İsmayıllı rayonunda və Abşeron ərazisində becərilmiş buğda və bəzən də yulaf bitkilərində aşağı (10-20S) və yuxarı (50S) səviyyədə gövdə pasının yayıldığı müəyyən edilmişdir. Hal-hazırda dünyada buğda məhsulunu hətta 90-100% məhv edən gövdə pasının yeni "Ug99" rası yayılmağa başlamışdır (Beard et al., 2006, Yu et al., 2014 ). *Ug99* ras qrupunun fəal olduğu sahələrdə aparılan test işlərində beynəlxalq buğda genetik materialının 80-90%-nin bu rasa qarşı həssas olduğu bildirilir. Gövdə pasının *Ug99* rası Yaxın Şərq ölkələrində geniş yayılmış və Mərkəzi Asiya ölkərinə də miqrasiya edir (Bara-nova et al., 2015). İran İslam Respublikasının Azərbaycanla 400-500 km məsafəlik ərazisində də bu təhlükəli rasaya rast gəlinmişdir. Buna görə də respublikamızda təsadüf olunan gövdə pası nümunələrinin ras tərkibini molekulyar səviyyədə müəyyənləşdirmək məqsədilə AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu ilə ABŞ Kənd Təsərrüfatı Departamenti Bitki xəstəlikləri laboratoriyası ilə birgə tədqiqatlar aparmışdır. 2014-2015-ci illərdə Azərbaycanın müxtəlif regionlarından toplanmış buğda genotiplərini yoluxdurmuş gövdə pası *Puccinia graminis* f. sp. *tritici* (*Pgt*) izolyatlarının molekulyar diaqnostikası və genotipləşdirilməsi məqsədi ilə ikimərhələli skrininq aparılmışdır. İlk olaraq Ug99 ras qrupunu aşkar etmək üçün *qPZR-analiz* həyata keçirilmiş və mənfi nəticə alınmışdır. İkinci mərhələdə yüksək keçirici SNP (*Single nucleotide polymorphism)* genotipləşdirmə metodu ilə yerli Ptg populyasiyasında 17 Multi-lokus üzrə genotipləşdirmə (MLGs) səviyyəsində genetik müxtəliflik aşkar edilmiş, bunların 18,5%-nin TKTTF ras qrupuna, yerdə qalan nümunələrin elm üçün yeni olan fərqli ras qrupuna aid olduğu müəyyənləşdirilmişdir (Huseynova et al., 2015).

Gövdə pası obliqat parazit olub təbiətdə böyüməsi və çoxalması üçün sahib bitki toxumasına ehtiyacı var. *Puccinia graminis tritici* patogeninin inkişafı iki sahib bitkidə, zirinc və taxıl bitkilərində gedir. O, 5 fərqli spor mərhələsi ilə tamamlanan heterozis tipli pas göbələyidir, sahib bitkiyə qeyri-cinsi çoxalma mərhələsi müddətində yoluxur (Leonard and Szabo, 2005, Olivera et al., 2015). Gövdə pasına yoluxmuş bitki yarpaqlarında fotosintezin intensivliyinin sağlam yarpaqlara nisbətən 30% azaldığı bildirilir. Gövdə pasına yoluxmuş taxılların gövdə

və yarpaqlarında çoxlu sayda uredium yataqları formalaşır. Qırmızı-qəhvəyi rəngli urediniosporlar gövdə və yarpağın hər iki səthində ləkələr şəklində meydana gəlir. Göbələk pustulaları gövdənin epidermisini dağıtdığı üçün ilkin olaraq transpirasiya prosesi zəifləyir və bu bitkinin ümumi metabolizminə mənfi təsir göstərir. Həmçinin, bitkinin vaskulyar sistemi zədələnir. Vaxt keçdikcə bir-birinə yaxın yerləşən ləkələr bir-birilə birləşir və fotosintez sahəsini azaldaraq, məhsularlığın aşağı düşməsinə səbəb olur. Eyni zamanda göbələyin mitseliləri sahib bitkinin hüceyrəarası məsamələrinə daxil olur və haustorilərlə bitki toxumasının inkişafını təmin edən əsas qida maddələrini sorur və bitkinin zəifləməsinə səbəb olur (Schumann et al., 2011; Singh et al., 2002)

Dünyanın müxtəlif ölkələrində buğda sortlarında pas xəstəliklərinə davamlı genlərinin identifikasiyasına və onların müxtəlif coğrafi regionlarda effektivliyinin tədqiqinə dair çoxlu miqdarda tədqiqat işləri aparılır. Genetik davamlılıq gövdə pasının idarə olunmasında istifadə olunan ən effektiv üsullardan biridir. *Komugi Wheat Genetics Resource Database* verilənlər bazasında 69 gövdə pasına qarşı davamlılıq geni (o cümlədən, 45 identifikasiya olunmuş *Sr* geni və 24-müvəqqəti təyinatlı genlər) qeydiyyatdan keçirilmişdir. Davamlı buğdanın yaradılmasında maksimum effektə nail olmaq üçün davamlılıq genlərinin düzgün kombinasiyalarından istifadə etmək vacibdir (Nirmala et al., 2016) .

Tədqiqat işinin əsas məqsədi gövdə pasının Azərbaycanda yayılan TKTTF ras qrupuna effektiv davamlılıq Sr11, Sr26 və Sr31 genlərinin identifikasiya edilməsidir.

## MATERİAL VƏ METODLAR

***Tədqiqat obyekti kimi*** Əkinçilik Elmi-Tədqiqat İnstitutunun buğda genofondunda saxlanılan, xəstəliklərə davamlılığına, məhsuldarlığına və digər fizioloji əlamətlərinə görə fərqlənən bərk və yumşaq buğda genotiplərindən istifadə edilmişdir.

***DNT-nin ekstraksiyası.*** Bitki nümunələrindən CTAB metodu ilə (Murry and Thompson, 1980) nüvə DNT-si ayrılmışdır. Təzə yarpaqlar götürülərək maye azot vasitəsilə toz halına salınmış və su hamamında 60°C-yə qədər qızdırılmış CTAB ekstraksiya buferində (100 mM Tris-HCl, pH 8,0; 20 mM EDTA, pH 8,0; 1,4 mM NaCl; 40 mM β-merkaptoetanol) lizis edilmişdır. Ektraksiya olunan DNT nümunələri TE (10 mM Трис-HCl, pH 8; 1 mM ЭДТА) buferində saxlanılmışdır.

***DNT-nin təmizlik dərəcəsinin və optik sıxlığının təyini.*** Spektrofotometrik yolla ayrılmış DNT nümunələrinin təmizlik dərəcəsi yoxlanılmışdır (ULTROSPEC 3300 PRO ("AMERSHAM", ABŞ). DNT nümunələrinin optik sıxlığı 260 və 280 nm dalğa uzunluğunda təyin edilmiş və 1,8≤ $[D_{260}/D_{280}]$ ≥2 şərti ödəyən DNT nümunələri növbəti təcrüblər üçün götürülmüşdür.

***KASP-genotipləşdirmə.*** KASP (Kompetitive Allele Specific PCR - rəqabətli allel-spesifik PZR) genotipləşmə sistemi homogen, fluoressent genotipləşmə texnologiyasıdır. Tədqiqat zamanı bir nümunə üçün ümumi reaksiyanın həcmi 20 µl (10µl kDNT-si + 10 µl reaksiya qarışığı) təşkil etmişdir. RT-PZR reaskiyası üçün istifadə edilən DNT nümunələrinin qatılığı 50 ng/ µl olmuşdur. Reaksiyanın daha optimal getməsi üçün Kasp Master Miksə final qatılığında 1x 2,5 mM olmaqla $MgCl_2$ əlavə edilmişdir. Kasp assay miksin tərkibinə iki allel-spesifik və bir ümumi revers praymer daxildir. Universal Kasp Master miks PZR reaksiyası üçün lazım olan bütün komponentlərə malikdir. Kasp Master miksin tərkibinə iki ədəd fluoressent nişanlanmış kasset, Kasp Taq polimeraza fermenti, dNTPs (dATP, dCTP, dGTP və dTTP), reaksiya üçün lazım olan müxtəlif duzlar və reaksiya buferi daxildir. KASP-genotipləşdirmə texnologiyası ilə Sr11 genini identifikasiya etmək üçün rəqabətli allel-spesifik PZR-i aparmağa imkan verən iki müxtəlif KASP markerindən istifadə edilmişdir (cədvəl 1).

Praymer miksin hazırlanması üçün uyğun KASp_6BL_BS00074288_51 A1 praymerindən 6

**Cədvəl 1.** *Sr11* geninin identifikasiyası üçün istifadə olunan KASP praymerlərin nukleotid ardıcıllıqları

| N | Praymerlər | Nukleotid ardıcıllığı ( 5′ → 3′) |
|---|---|---|
| Miks #1 | KASp_6BL_BS00074288_51 A1 | GAAGGTGACCAAGTTCATGCTATGTAAATGTTGA GATACCTTAGCTGAAAT |
| | KASp_6BL_BS00074288_51 A2 | GAAGGTCGGAGTCAACGGATTGTAAATGTTGAGATACCTTA GCTGAAAC |
| | KASp_6BL_BS00074288_51 C | GGAAAACCGTCATCTCGCGTATGTA |
| Miks # 2 | Tdurum_contig55744_822 A1 | GAAGGTGACCAAGTTCATGCTAAACTCAAAGCTAAAGGATA AACTAGATGT |
| | Tdurum_contig55744_822 A2 | GAAGGTCGGAGTCAACGGATTCTCAAAGCTAAAGGATAAAC TAGATGG |
| | Tdurum_contig55744_822 C | CAACTGATCTAAGTTCCTTTGTCAATTCAT |

µl, KASp_6BL_BS00074288_51 A2 praymerindən 6 µl, KASp_6BL_BS00074288 _51 C praymerindən isə 15 µl götürülmüş və 23 µl Master Miks əlavə edilərək 54 mM qatılığa çatdırılmışdır. Analoji yolla T.durum_contig55744_822 praymeri üçün də miks hazırlanmışdır. Reaksiya yığıldıqdan sonra tərkiblər RT-PZR aparatına (Applied Biosystems 7500/7500 Fast Real-Time PCR System, USA) yerləşdirilmişdir.

RT-PZR analizin aparılması üçn reaksiya şəraiti cədvəl 2-də verilmişdir. İlk olaraq, reaksiya 94°C temperaturda DNT zəncirinin denaturasiyası ilə başlanmışdır. RT-PZR zamanı amplikon kiçik olduğundan, əvvəlki mərhələ ilə kombinə edildiyi üçün elongasiyanın getməsi üçün 60°C temperaturdan istifadə edilmişdir. Sonuncu mərhələdə fluoressensiyanın oxunması 30°C temperaturda həyata keçirilmişdir.

**Cədvəl 2.** Rəqabətli allel-spesifik PZR üçün reaksiya şəraiti

| Mərhələ | Reaksiya şəraiti | Tsikl sayı |
|---|---|---|
| 1 | 30⁰C, 1" | |
| 2 | 94⁰C, 15 ' | |
| 3 | 94⁰C, 20 " | 10 |
| | 61⁰C, 60 " | |
| 4 | 94⁰C, 20 " | |
| | 57⁰C, 60 " | 26 |
| 5 | 30⁰C, 1" | |

***Sr26 geninin identifikasiyası üçün PZR və gel-elektroforetik analiz.*** Sr 26 geninin təyini üçün Sr26#43F/Sr26#43R markerindən istifadə edilmişdir (Cədvəl 3). İlk olaraq, markerin DNT üzərinə oturma temperaturunu dəqiqləşdirmək məqsədilə, Multigene Gradient («Labnet», ABŞ) amplifikatorunda qradientli PZR aparılmışdır.

DNT-nin amplifikasiyası 10x bufer, 20 nq genom DNT, 0,2 mkM praymer, hər birindən 200 mkM olmaqla: dATP, dCTP, dGTP və dTTP, 2,5 mM $MgCl_2$ və 0,2 vahid Taq-polimerazadan ibarət 25 mkl-lik inkubasiya buferində həyata keçirilmişdir. PZR aşağıdakı şəraitdə getmişdir: 1 tsikl: 94°C-də 4dəq; 10 tsikl: 94°C-də 1 dəq, 36°C -də 1 dəq və 72°C-də 1 dəq; 35 tsikl: 94°C-də 1 dəq, 36,2°C-də 1 dəq, 72°C-də - 1 dəq; Tamamlayıcı elonqasiya tsikli 72°C-də 15 dəq müddətində həyata keçirilmişdir. Reaksiya məhsulları etidium-bromid əlavə edilmiş 1,2%-li aqaroza gelində elektroforez aparılmaqla ayrılmış və *UVITEK* Gel Documentation System-in köməkliyi ilə sənədləşdirilmişdir.

***Sr31 geninin identifikasiyası üçün PZR və gel-elektroforez analiz.*** Buğda genotiplərində Sr 31 geninin identifikasiyası məqsədilə iag95F/iag95R markeri tətbiq olunmuşdur. Markerin DNT üzərinə oturma temperaturunu dəqiqləşdirmək məqsədilə qradient PZR qoyulmuşdur. DNT-nin amplifikasiyası 10x bufer, 20 nq genom DNT, 0,2 mkM praymer, hər birindən 200 mkM olmaqla: dATP, dCTP, dGTP və dTTP, 2,5 mM $MgCl_2$ və 0,2 vahid Taq-polimerazadan ibarət 30 mkl-lik inkubasiya buferində həyatakeçirilmişdir. PZR aşağıdakı şəraitdə getmişdir: tsikl 1: 94°C-də 3dəq; tsikl 30: 30 san 94°C-də, 1 dəq 51,5°C -də və 70 san 72°C-də; Tamamlayıcı elonqasiya tsikli 72°C-də 10 dəq müddətində həyata keçirilmişdir. Reaksiya məhsulları etidium-bromid əlavə edilmiş 1%-li aqaroza gelində elektroforez aparılmaqla ayrılmış və *UVITEK* Gel Documentation System-in köməkliyi ilə sənədləşdirilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

*Puccinia graminis f. sp. tritici* tərəfindən törədilən buğdanın gövdə pası xəstəliyi ciddi məhsul itkisinə səbəb olur. Genetik davamlılıqdan istifadə edilərək gövdə pasının idarə edilə bilməsinə baxmayaraq, *Puccinia graminis f. sp. tritici*-nin dinamik populyasiyası tez-tez buğdanın gövdə pasına davamlılıq genlərini üstələyir. Genetik baxımdan yeni davamlılıq genlərinin axtarışı, eyni zamanda ras-spesifik və qeyri-spesifik davamlılığı özündə cəmləşdirən sortların yaradılması bu xəstəliyə qarşı uzunmüddətli və effektiv davamlılığı təmin edir. Buna görə də davamlı sortların yaradılması üçün, daimi davamlılığın yeni donorlarının, başqa sözlə, hələlik seleksiyada istifadə olunmayan genlərlə müdafiə olunan, çarpazlaşdırma zamanı əlaməti asanlıqla verə bilən yüksək davamlı nümunələrin axtarılması tələb olunur.

**Cədvəl 3.** Buğdada gövdə pasına davamlılıq genlərinin identifikasiyası üçün istifadə olunmuş molekulyar markerlər haqqında məlumat

| Praymerlər | Genlər | Nukleotid ardıcıllığı ( 5′→ 3′) | Xromosomda lokalizasiyası | Gözlənilən fraqment (bp | Ann. temp. (°C) |
|---|---|---|---|---|---|
| iag95F<br>iag95R | Sr31 | CTC TGT GGA TAG TTA CTT GAT CGA<br>CCT AGA ACA TGC ATG GCT GTT ACA | 1B | 1100 | 51,5 |
| Sr26#43F<br>Sr26#43R | Sr26 | AAT CGT CCA CAT TGG CTT CT<br>CGC AAC AAA ATC ATG CAC TA | 6A | 207(250) | 56,3 |

***KASP-genotipləşdirmə texnologiyası ilə Sr11 geninin molekulyar identifikasiyası.*** KASP (*Competitive Allele Specific PCR* – rəqabətli allel-spesifik PZR) genotipləşdirmə texnologiyası tətbiq olunmaqla, buğda genotiplərinin rüşeym plazması Sr11 geninə görə skrininq edilmişdir. Xromosom lokalizasiyası haqqında məlumatların mövcudluğuna baxmayaraq, buğda seleksiyası proqramlarında *Sr11* geninin seçilməsi üçün diaqnostik markerlər, demək olar ki, mövcud deyildi. 2016-cı ildə ABŞ Kənd Təsərrüfatı Departamenti Bitki xəstəlikləri laboratoriyasının əməkdaşları tərəfindən buğda genomunda *Sr11* genini identifikasiya etməyə imkan verən KASP markerləri işlənib hazırlanmışdır. Azərbaycanda ilk dəfə olaraq, bu texnologiyadan istifadə etməklə, tək nukleotid polimorfizminə əsaslanan (SNP) qPZR metodu tətbiq edilməklə, buğda genotiplərinin genomları *Sr11* geninə görə yoxlanılmışdır.

Diallel tipli *KASp_6BL_Tdurum contig55744_822* molekulyar markeri ilə aparılan Real zamanda gedən PZR nəticəsində analiz olunan 34 buğda genotipindən 9-nun (Səba, Mirvari, Xəzri, Pirşahin, Əlincə 84, Qaraqılçıq-2, Fərəhim, Farandole, Tigre) 6B xromosomunda Sr11 geninin mövcudluğu aşkar olunmuşdur. İstifadə etdiyimiz markerlər rəqabətli allel-spesifik markerlər olduğundan, onlar genin hər iki allelini identifikasiya etməyə imkan verir. Cədvəl 4-də *KASp_6BL_Tdurum contig55744_822* markeri ilə aparılan qPZR-in nəticələri verilmişdir. Cədvəldən göründüyü kimi, bu marker tədqiq etdiyimiz genotiplərdə Sr11 geninin yalnız bir allelini identifikasiya etmişdir. Bu onu göstərir ki, həmin genotiplər *Sr11* geninə görə heterozigotdur.

Tədqiqat zamanı istifadə olunan ikinci diallel tipli *KASP_6BL_BS0074288_51* markeri ilə aparılan qPZR-in nəticələri Cədvəl 5-də göstərilmişdir. Yoxlanılmış 10 genotipdən 7-də *Sr11* geninə görə müsbət nəricə əldə edilmişdir. Bunlar Mirbəşir-50, Qiymətli-2/17, Saratovskaya-29, Kollektivnaya-77, Farandole, Tigre, Tale-38 genotipləridir. *KASP_6BL_BS0074288_51* markeri də rəqabətli allel-spesifik marker olduğundan *Sr11* geninin hər iki allelini analiz etmək imkanı yaranır. Belə ki, Mirbəşir-50, Qiymətli- 2/17, Saratovskaya-29 genotiplərində *Sr11* geninin bir allellini, Kollektivnaya-77, Farandole, Tigre, Tale-38 genotiplərində isə ikinci allelini təyin etmək mümkün olmuşdur. Başqa sözlə, *Sr11* geni bu genotiplərdə heterozigot haldadır. Bu markerlə aparıln qPZR nəticəsində 3 genotipdə (Dağdaş, Nurlu-99, Qırmızı buğda) müsbət nəticə əldə edilmişdir.

*Sr11* geni buğda genomunun 6B xromosomunda, sentromerə yaxın olan inhibitor B2 genindən 60 santimorgan (cM) məsafədə yerləşir. *Sr11* geninin qonur yarpaq pasına davamlılıq geni *Lr3* ilə ilişikli olduğu göstərilmişdir (Sears. 1966). Bajgain və həmmüəllifləri tərəfindən göstərilmişdir ki, gövdə pasının TKTTF ras qrupuna qarşı davamlılıq xromosomun 6 BL qolunda (Şəkil 1), SNP markerləri olan *IWB73072* (proksimal) və *IWB10724* (distal) arasında yerləşir.

**Cədvəl 4.** *Sr11* geni ilə assosiasiya təşkil edən diallel tipli KASP_6BL_Tdurum contig 55744_822 markeri ilə aparılan qPZR-in nəticələri

| N | Genotiplər | *Sr11* geni | |
|---|---|---|---|
| | | Allel 1 | Allel 2 |
| 1 | Səba | + | - |
| 2 | Əlincə-84 | + | - |
| 3 | Turan | - | - |
| 4 | Gilavar | - | - |
| 5 | Mirvari | + | - |
| 6 | Qaraqılçıq-2 | + | - |
| 7 | Pərvin | - | - |
| 8 | Xəzri | + | - |
| 9 | Ləyaqətli-80 | - | - |
| 10 | Fərəhim | + | - |
| 11 | Altun-2 | - | - |
| 12 | Dağdaş | - | - |
| 13 | Əkinçi-84 | - | - |
| 14 | Beltaqo | - | - |
| 15 | Pirşahin | + | - |
| 16 | Bərəkətli-95 | - | - |
| 17 | Vüqar | - | - |
| 18 | Tərtər | - | - |
| 19 | Yaqut | - | - |
| 20 | Ruzi-84 | - | - |
| 21 | Günəşli | - | - |
| 22 | Farandole | + | - |
| 23 | Qarabağ | - | - |
| 24 | Yeganə | - | - |
| 25 | Bəyaz | - | - |
| 26 | Mirbəşir-50 | - | - |
| 27 | Qiymətli- 2/17 | - | - |
| 28 | Saratovskaya- 29 | - | - |
| 29 | Kollektivnaya- 77 | - | - |
| 30 | Dağdaş | - | - |
| 31 | Nurlu 99 | - | - |
| 32 | Qırmızı buğda | - | - |
| 33 | Tigre | + | - |
| 34 | Tale 38 | - | - |

**Cədvəl 5.** *Sr11* geni ilə assosiasiya təşkil edən diallel tipli KASP_6BL_BS0074288_51 markeri ilə aparılan qPZR-in nəticələri

| N | Genotiplər | *Sr11* geni | |
|---|---|---|---|
| | | Allel 1 | Allel 2 |
| 1 | Mirbəşir-50 | + | - |
| 2 | Kollektivnaya-77 | - | + |
| 3 | Saratovskaya-29 | + | - |
| 4 | Qiymətli-2/17 | + | - |
| 5 | Şəfəq | - | - |
| 6 | Tigre | - | + |
| 7 | Şirvan | - | - |
| 8 | Tale- 38 | - | + |
| 9 | Nurlu-99 | - | - |
| 10 | Farandole | - | + |







**Şəkil 1**. Buğdanın B genomunun 6-cı xromosomunda *Sr11*geninin lokalizasiyası (solda). 6BL xromosomunda *Sr11* geninin genetik əlaqə xəritəsi (sağda) (Olivera et al. 2015).

Bu iki marker *Sr11* ilə uyğun olaraq 0,7 və 0,3 məsafəsində lokalizasiya olunmuşdur (Bajgain et al., 2015). *Puccinia graminis* f. sp. *tritici*-nin TKTTF ras qrupu 2013 və 2014-cü illərdə Efiopiyada Ug-99-a davamlı "*Digalu*"-da epidemiyaya səbəb olmuşdur (Olivera et al., 2015). Sr11 geninin TKTTF rasına qarşı davamlılığı "*Gabo 56*" genotipində sübut edilmişdir. Nirmala və həmmüəlliflər "*Gabo 56*" və "*Chinese Spring*" buğdaları ilə aparılmış təcrübədə *Sr11* ilə ilişikli 7 tək nukleotid polimorfizm markerlərini aşkar ediblər. "Berkut"/ "Scalavatis" populyasiyasında *Sr11* üçün ayrılmış 5 SNP marker rəqabətli allel-spesifik polimeraz zəncir reaksiya (KASP) ilə təstiq edilmişdir (Nirmala et al., 2016).

***Buğdanın rüşeym plazmasında Sr26 geninin dominant STS markerlə təyini.*** Buğda genofondunda saxlanılan genitiplərin rüşeym plazması *Sr26* geninə görə yoxlanılmışdır. Bu məqsədlə buğdanın 6A xromosomunda *Sr26* genini identifikasiya etməyə imkan verən dominant Sr26#43F/R STS marker istifadə edilmişdir. Bu praymer Sr26 geninə malik olan genotiplərdə 207 bp ölçüsündə diagnostik amplikonun sintezinə cavabdehdir.

Tədqiqat zamanı 42 buğda genotipinin nüvə DNT-si ilə STS-PZR aparılmışdır. Amplifikasiya məhsullarının gel-elektroforez profilləri Şəkil 2-də göstərilmişdir. Şəkildən aydın olmuşdur ki, Qarabağ, Sarıçanaq-98, Ləyaqətli, Murov-2, Mironovka-808, Mirbəşir-128, Qiymətli-2/17, Əkinçi-84, Mirbəşir-50, 1st WWEERYT4, Günəşli buğda genotiplərində 207 n.c. uzunluğunda fraqmentlər amplifikasiya olunur. Bu fraqmentin *Sr26* üçün diaqnostik fraqment olduğunu nəzərə alaraq, belə bir nəticəyə gələ bilərik ki, yuxarıda adı çəkilən 11 buğda genotipinin 6A xromosomlarında *Sr26* geninin uyğun alleli mövcuddur. Tədqiq olunan genotiplərdən 31-də fraqment sintezi müşahidə olunmamışdır (Cədvəl 6).

**Cədvəl 6.** *Sr26* geni üçün spesifik dominant STS marker Sr26#43 ilə aparılan PZR-in nəticələri

| № | Genotiplər | 207 bp | № | Genotiplər | 207 bp |
|---|---|---|---|---|---|
| 1 | Bərəkətli-95 | – | 22 | Qızıl buğda | – |
| 2 | Qarabağ | + | 23 | Zirvə | – |
| 3 | Sarıçanaq | + | 24 | Aran | – |
| 4 | Tərtər | – | 25 | Azəri | – |
| 5 | Şərq | – | 26 | Fərəhim | – |
| 6 | Mironovka | + | 27 | Mirbəşir-50 | + |
| 7 | Saratovskaya-29 | – | 28 | Farandole | – |
| 8 | Ləyaqətli | + | 29 | Tigre | – |
| 9 | Dağdaş | – | 30 | Qaraqılçıq-2 | – |
| 10 | Mirbəşir-128 | + | 31 | Şiraslan-23 | – |
| 11 | Murov | + | 32 | Renon | – |
| 12 | Qırmızıgül | – | 33 | Fransa | – |
| 13 | Əlincə | – | 34 | Vüqar | – |
| 14 | Nurlu-99 | – | 35 | 1st WEERYT4 | + |
| 15 | Qiymətli-2/17 | + | 36 | 11thFAWWONN22 | – |
| 16 | Əkinçi | + | 37 | A2 | – |
| 17 | Əzəmətli-95 | – | 38 | 12thFAWWONN97 | – |
| 18 | Tale-38 | – | 39 | 4th FEFWSN N50 | – |
| 19 | Ruzi | – | 40 | Günəşli | + |
| 20 | Pirşahin-1 | – | 41 | Pərzivan-2 | – |
| 21 | Qırmızı buğda | – | 42 | Fatima | – |

Sr26#43 dominant STS markeri Sr26 genini identifikasiya etmək üçün işlənilib hazırlanmışdır (Mago et al. 2002) və bu markerdən marker asılı seleksiya proqramlarında (marker-assisted selection - MAS) istifadə olunur (Bariana et al. 2007).

2007-ci ildə Keniyada *Sr26* geninə virulent TTTSK rası aşkar edilmişdir.Ədəbiyyat məlumatlarında göstərilir ki, *Sr26* və *Sr25* davamlılıq genləri TTKST və TTTSK ras qruplarına qarşı effektivlidir. Bu genlər TTKST və TTTSK rasları daxil olan TTKS qrupuna qarşı mübarizədə istifadə edilən bir neçə əsas genlər sırasındadır (Singh et al., 2006; Jin et al., 2007). Hər iki gen *Thinopyrum* (Th) *ponticum* (Podp.)-dan buğdaya köçürülmüşdür. Sr26 daşıyan seqment 6A buğda xromosomu-




**Şəkil 2.** *Sr26* geni üçün Sr26#43 dominant STS praymeri ilə əldə edilmiş PZR məhsullarının 1,2%-li aqaroza gelində analizinin profilləri. Ox işarəsi 207 n.c.uzunluğunda DNT fraqmentini göstərir. M–DNT markeri-100 bp. 1–Bərəkətli-95, 2-Qarabağ, 3–Sarıçanaq 98, 4 – Tərtər, 5 – Şərq, 6 - Miranovka 808, 7 – Saratovskaya-29, 8–Ləyaqətli, 9–Dağdaş, 10 - Mirbəşir 128, 11 - Murov 2, 12 – Qırmızı gül-1, 14 – Nurlu 99, 15 – Qiymətli-2/17.




**Şəkil 4.** Buğdanın 1BL.1RS translokasiyasında *Sr31* geni üçün spesifik iag95 praymerinin tətbiqi ilə əldə edilmiş PZR məhsullarının 1%-li aqaroza gelində analizinin profilləri. Ox işarəsi 1100 bp uzunluğunda DNT fraqmentini göstərir. M – DNT markeri -100 bp. 1 – Bərəkətli-95, 2 - Qarabağ, 3 – Sarıçanaq-98, 4 – Tərtər, 5 – Şərq, 6 – Miranovka- 808, 7 – Saratovskaya-29, 8 – Ləyaqətli, 9 – Dağdaş, 10 - Mirbəşir-128, 11 – Murov-2, 12 – Qırmızı gül-1, 13–Əlinc-84, 14 –Nurlu- 99, 15 – Qiymətli-2/17.

nun uzun qoluna köçürülmüşdür (Şəkil 3) və Avstraliyada davamlılıq mənbəyi kimi istifadə edilir (Friebe et al., 1994). Buğdaya bu genin köçürülməsi nəticəsində qısaldılmış yad seqment ilə yeni xətt inkişaf etdirilmiş və bu zaman məhsul itkisi baş verməmişdir.

Əldə olunmuş PZR profillərindən görünür ki, axtarılan 207 bp uzunluqda olan fraqmentdən əlavə müxtəlif ölçülü digər fraqmentlər də sintez olunmuşdur. İstifadə edilən buğda genotiplərinin əksəriyyətində 303 bp ölçüsündə DNT fraqmentləri aydın görünür. Bu fraqmentlərin izahını vermək üçün ko-dominant markerlərdən istifadə edilməsi məqsədəuyğun sayılır. Homoziqotları heteroziqotlardan ayırmaq üçün ko-dominant markerlərə ehtiyac duyulduğundan *Sr26* geni üçün ko-dominant markerlər test edilmişdir. Həmçinin, 6AL xromosomuna spesifik 5 markerin heç biri *Eagle* buğdasının PZR məhsulunda amplifikasiya olunmamışdır. *Sr26* geninin heteroziqot və homoziqot olmasını fərqləndirmək üçün 6AL-spesifik BE518379 və SR26 markerləri Sr26#43markeri ilə birlikdə multipleks halda istifadə olunmaqla PZR aparılmışdır. 6AL-spesifik markeri BE518379 sürətli işləmiş və 303 bp uzunluğundakı allel Sr26#43 markeri tərəfin-dən amplifikasiya olunmuş 207 n.c.uzunluğundakı fraqmentlərdən aqaroza gelində aydın ayrılmışdır. Əlavə buğda xətlərini genotipləşdirmək üçün BE518379 və Sr26#43 praymerləri bərabər miqdarda kombinə edilmişdir.

**Cədvəl 7.** *Sr31* geni üçün spesifik iag95 praymeri ilə aparılan PZR-in nəticələri.

| № | Genotiplər | 1100 bp | № | Genotiplər | 1100 bp |
|---|---|---|---|---|---|
| 1 | Bərəkətli-95 | – | 22 | Qızıl | -- |
| 2 | Qarabağ | – | 23 | Zirvə- 85, | + |
| 3 | Sarıçanaq- 98 | – | 24 | Aran | + |
| 4 | Tərtər | – | 25 | Azəri | -- |
| 5 | Şərq | – | 26 | Fərəhim | -- |
| 6 | Miranovka- 808 | – | 27 | Mirbəşir- 50 | -- |
| 7 | Saratovskaya- 29 | + | 28 | Farandole | -- |
| 8 | Ləyaqətli | – | 29 | Tigre | -- |
| 9 | Dağdaş | – | 30 | Qaraqılçıq-2 | -- |
| 10 | Mirbəşir- 128 | – | 31 | Şiraslan- 23 | -- |
| 11 | Murov | – | 32 | Renon | -- |
| 12 | Qırmızı gül- 1 | + | 33 | Fransa | -- |
| 13 | Əlincə- 84 | – | 34 | Vüqar | -- |
| 14 | Nurlu- 99 | + | 35 | 1st WWEERYT4 | -- |
| 15 | Qiymətli- 2/17 | – | 36 | 11thFAWWONN22 | -- |
| 16 | Əkinçi - 84 | – | 37 | A2 | -- |
| 17 | Əzəmətli- 95 | – | 38 | 12thFAWWONN97 | + |
| 18 | Tale- 38 | + | 39 | 4th FEFWSN N50 | -- |
| 19 | Ruzi- 84 | – | 40 | Günəşli | + |
| 20 | Pirşahin- 1 | – | 41 | Pərzivan- 2 | -- |
| 21 | Qırmızı buğda | – | 42 | Fatima | |

***Buğdanın 1BL.1RS translokasiyasında Sr31 geninin spesifik İag95 praymeri ilə identifikasiyası.*** Buğda genotiplərində 1BL.1RS translokasiyasında yerləşən Lr26-Sr31-Yr9 lokusu spesifik İag95 praymeri ilə yoxlanılmışdır. Aparılan PZR nəticələrinin gel-elektroforetik profilləri şəkil 4-də göstərilmişdir. İag95 praymeri 1100 bp ölçüsündə amplikonun sintezi üçün cavabdehdir. Şəkildən göründüyü kimi, 8 buğda genotipində gözlənilən fraqmentlər amplifikasiya olunmuşdur. Bu nəticə onu göstərir ki, Saratovskaya-29, Qırmızı gül-1, Nurlu-99, Tale-38, Zirvə-85, Aran, 12th FAWWON N97, Günəşli genotiplərinin genomlarında 1BL.1RS translokasiyasında Sr31 geni mövcuddur. Digər 24 buğda genotipində isə *Sr31* geni aşkar olunmamışdır (Cədvəl 7).

Son zamanlar inkişaf etdirilmiş Sec-1 lokusunu daşımayan, 1RS-i daşıyan buğda-çovdar rekombinant xətləri çovdardan gövdə pası davamlılığını keyfiyyət itkisi olmadan köçürməyə imkan verir (Lukaszewski, 2000). Gövdə pasına qarşı davamlılıq geni daşıyan çovdar seqmenti üçün PZR əsaslı markerlərin dizayn etdirilməsi bu genlərin köçürülməsinə imkan yaradacaqdır. Bu artıq gövdə pasına davamlılq geni daşıyan xətlərə çovdar seqmentinin köçürülməsi zamanı da vacibdir. İag95 praymeri 1RS xromosomunda lokalizasiya olunan *Sr31* geninin 1100 bp uzunluğunda DNT fraqmentlərinin amplifikasiyası üçün dizayn olunmuşdur. Sr31 gövdə pası davamlılıq geni çovdar bitkisinin 1-ci xromosomunun qısa qolununda yerləşir. Bu gen Avstraliyada gövdə pası patogeninə qarşı effektiv şəkildə istifadə olunur. *Sr31* üçün hazırlanan 1BL·1RS (Pavon wheat/Petkus rye) və ya 1DL·1RS (Gabo wheat/Imperial rye) markerləri translokasiya xromosomu olan buğda genotiplərinin ilkin identifikasiyası üçün istifadə edilmişdir. Daha sonra bu markerlər 1RS qolunun sadəcə bir hissəsini daşıyan buğda-çovdar rekombinant xətlərində olan xüsusi seqmentlər üçün spesifik olaraq hazırlanmışdır.

Beləliklə, müasir molekulyar-bioloji metod və texnologiyalar tətbiq olunmaqla buğda genotiplərində *Puccinia graminis* Pers. f. sp. *tritici* patogenə qarşı effektiv davamlı *Sr* genlərini identifikasiya etməklə, yerli sortların genetik cəhətdən davamlılıq potensialını qiymətləndirmək mümkündür. Alınan nəticələr gələcəkdə müxtəlif seleksiya proqramlarında istifadə oluna bilər.

## ƏDƏBİYYAT


**Bajgain P., Rouse M.N., Bulli P. et al.** (2015) Association mapping of North American spring üheat breeding germplaasm reveals loci conferring resistance to Ug99 and other African stem rust races. *BMC Plant Biol.,* **15:** 249 (19 p.).

**Baranova O.A., Lapochkina I.F., Anisimova A.V. et al.** (2016) Identification of Sr genes in new common wheat sources of resistance to stem rust race Ug99 using molecular markers. *Russian Journal of Genetics: Applied Research*, **6(3):** 344-350.

**Beard C., Jayasena K., Thomas G., Loughman R.** (2006) Managing stem rust of wheat. *Plant Pathology, Department of Agriculture. Western Australia: Farmnote* 73/2004.

**Friebe B., Jiang J., Knott D.R., Gill B.S.** (1994) Compensation indexes of radiation-induced wheat *Agropyron elongatum* translocations conferring resistance to leaf rust and stem rust. *Crop Sci.,* **34:** 400-404.

**Huseynova I.M., Ibrahimov E.R., Rustamova S.M., Hajiyeva A.T., Sadigov Sh.F., Aghayeva D.N., Szabo L.J., Aliyev J.A.** (2016) Molecular Study Of Pgt Races In Azerbaijan. *International Conference "Innovative Approaches to Conservation of Biodiversity" dedicated to the 80th Anniversary of the Institute of Botany, Azerbaijan National Academy of Science,* p. 151.

**Jin Y., Singh R.P., Ward R.W., Wanyera R., Kinyua M., Njau P., Pretorius Z.A.** (2007) Characterization of seedling infectiontypes and adult plant infection responses of monogenic Sr gene lines to race TTKS of *Puccinia graminis* f. sp. *tritici*. *Plant Dis.,* **91:** 1096–1099.

**Leonard K.J., Szabo L.J.** (2005). Stem rust of small grains and grasses caused by *Puccinia graminis*. *Molecular plant pathology,* **6(2):** 99-111.

**Lukaszewski A.J.** (2000) Manipulation of the 1RS. 1BL translocation in wheat by induced homoeologous recombination. *Crop Sci.,* **40:** 216–225.

**Mago R., Spielmeyer W., Lawrence G.J., Lagudah E.S., Ellis J.G., Pryor A.** (2002) Identification and mapping of molecular markers linked to rust resistance genes located on chromosome 1RS of rye using wheat-rye trans-location lines. *Theor. Appl. Genet.*, **104(8):** 1317-1324.

**Murray M.G., Thompson W.F.** (1980). Rapid isolation of high molecular weight plant DNA. *Nucleic acids research*, **8(19):** 4321-4326.

**Nirmala J., Chao S., Olivera P. et al.** (2016) Markers linked to wheat stem rust resistance gene Sr11 effective to *Puccinia graminis* f. sp. *tritici* race TKTTF. *Phytopathology,* **106(11):** 1352-1358.

**Oliveira P., Newcomb M., Szabo L.J. et al.** (2015) Phenotypic and genotypic characterization of race TKTTF of *Puccinia graminis* f. sp. *tritici* that caused a wheat stem rust epidemic in Southern Ethiopia in 2013-2014. *Phytopathology*, **105(7):** 917-928.

**Schumann G.L., Leonard K.J.** (2011) Stem rust of wheat (black rust). *The Plant Health Instructor*.

**Sears E.R.** (1966) Choromosome mapping th with aid of telocentrics. *Proc. of 2nd Int. Wheat Genet.Symp. Hereditas Suppl.* Sweden: Lund, p. 370-381.

**Singh R.P., Hodson D., Huerta-Espino J. et al.** (2008) Will stem rust destroy the world's wheat crop? *Advances in Agronomy,* **98:** 272–309.

**Singh R.P., Hodson D.P., Jin Y., Huerta-Espino J.** (2006) Current status, likely migration and strategies to mitigate the threat to wheat from race Ug99 (TTKS) of stem rust pathogen. *CAB Rev. Perspect. Agric. Vet. Sci. Nutr. Nat. Resour.,* **1:** 1-13.

**Singh R.P., Huerta-Espino J., Roelfs A.P.** (2002) The wheat rusts. *Bread Wheat: Improvement and production, FAO Plant Production and Protection Series*, **No. 30.**

**Yu G., Champouret N., Steuernagel B.** ((2017) Discovery and characterization of two new stem rust resistance genes in *Aegilops sharonensis. Theor. Appl. Genet.*, **30(6):** 1207-1222.

**Yu L.-X., Barbier H., Rouse M.N. et al.** (2014). A consensus map for Ug99 stem rust resistance loci in wheat. *TAG. Theoretical and Applied Genetics. Theoretische Und Angewandte Genetik*, **127(7):** 1561–1581.

## Идентификация Генов *Sr11, Sr26* и *Sr31* Эффективной Устойчивости к Расе Стеблевой Ржавчины TKTTF у Генотипов Пшеницы в Условиях Азербайджана

**С.М. Рустамова, А.Е.Гаджиева, Ш.Ф. Садыгов, А.Ч. Мамедов, И.М. Гусейнова**

*Институт молекулярной биологии и биотехнологий НАН Азербайджана*

Впервые с применением технологии генотипирования KASP (Kompetitive Allele Specific PCR) исследована зародышевая плазма пшеницы и дана характеристика генетических источников эффективной устойчивости против распространенной на территории Азербайджана стеблевой ржавчины расовой группы TKTTF. В результате анализов ПЦР (ОТ-ПЦР) в реальном времени, проведенных с использованием диаллельного праймера KASP_6BL_BS0074288_51, в 6В хромосоме 9 из 34 генотипов, а при использовании праймера KASp_6BL_Tdurum contig55744_822 - 7 из 10 генотипов идентифицирован ген *Sr11.* При проведении ПЦР с использованием доминантного STS маркера Sr26#43, в 11 из 42 генотипов выявлен фрагмент размером 207 н.п., считающийся диагностическим ампликоном гена *Sr26.* При использовании специфического праймера İag95 для анализа, расположенного в 1BL.1RS транслокации локуса Lr26-Sr31-Yr9 в 8 из 42 генотипов выявлено наличие продуктов синтеза ПЦР длиной 1100 н.п., характерных для гена *Sr31.*

***Ключевые слова:*** *Пшеница, Puccinia graminis f. sp. tritici, Sr11, Sr26, Sr31, KASP-генотипирование, ОТ-ПЦР*

**İdentification Of *Sr11, Sr26* and *Sr31* Genes Effective Resistant To Stem Rust Rase TKTTF in Wheat Genotypes in Azerbaijan**

**S.M. Rustamova, A.T. Haciyeva, Sh.F. Sadigov, A.Ch. Mammadov, I.M. Huseynova**

*Institute of Molecular Biology and Biotechnologies, Azerbaijan National Academy of Sciences*

For the first time wheat germplasm has been examined and gene sources effective resistant to TKTTF ras group of stem rust spread in Azerbaijan have been characterized using KASP (Kompetitive Allele Specific PCR) genotyping technology. Real-time PCR (RT-RCR) analysis with diallel-type KASP_6BL_BS0074288_51 primer identified *Sr11*gene on 6B chromosome of 9 wheat genotypes from 34 ones, and it was identified in 7 genotypes from 10 ones when using KASp_6BL_Tdurum contig55744_822. A fragment of 207bp, which is considered to be the diagnostic amplicon for the*Sr26* gene has been synthesized in 11 wheat genotypes from 42 ones as a result of PCR performed with a dominant STS marker Sr26#43. Lr26-Sr31-Yr9 locus located in 1BL.1RS translocation of 42 wheat genotypes was analyzed using specific Iag95 primer and 1100 bp PCR products, characteristic of *Sr31* gene were found to be synthesized in 8 genotypes.

***Keywords:*** *Wheat, Puccinia graminis f. sp. tritici, Sr11, Sr26, Sr31, KASP-genotyping, RT-PZR*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh. 14-22 (2017)*

# 7 Ali Bitkinin Zülal Kodlaşdıran Nüvə Genlərinin Potensial Transkripsiya Start Saytlarının Müəyyənləşdirilməsi

**H.F. Quliyeva*, Ə.Ü. Abduləzimova, N.Ş. Mustafayev, İ.Ə. Şahmuradov**

*AMEA Molekulyar Biologiya və Biotexnologiya İnstitutu, Mətbuat prospekti, 2A, Bakı AZ1073, Azərbaycan; *E-mail: aliyeva-hokume@mail.ru*

**Birləpəli *Oryza sativa* və *Zea mays,* ikiləpəli *Arabidopsis thaliana, Glycine max, Medicago truncatula, Populus trichocarpa* və *Vitis vinifera* bitkilərinin müvafiq surətdə 22258, 23330, 17896, 18226, 17645, 38702 və 11035 zülal kodlaşdıran nüvə genlərinin [1000:+101] 5'-nahiyyələrində (+1: genlərin annotasiya olunmuş start nöqtəsi) TSSPlant kompüter proqramının köməyi ilə potensial transkripsiya start saytlarının (TSS) - promotorların axtarışı həyata keçirilmişdir. Nəticədə 7 bitki növündən 149092 genin hər biri üçün ən azı bir potensial TSS müəyyənləşdirilmişdir. Aşkar olunmuş promotorların həm bütün genlər üzrə, həm də ayrıca olaraq plastid və mitoxondri təyinatlı genlər üzrə müqayisəli təhlili aşkar etmişdir ki, bu orqanizmlərin hamısında bütün hallarda qeyri-TATA promotorlar aşkar üstünlük təşkil edirlər (~30% TATA/70% qeyri-TATA). Hər bir gen üçün annotasiya olunmuş gen başlanğıcına ən yaxın TSS götürülməklə, potensial TSS (TSSp) və gen başlanğıcı arasındakı məsafələrin təhlili göstərmişdir ki, bütün orqanizmlər üzrə genlərin təxminən 70%-i üçün bu məsafə 100 nc-dən çox deyildir. Bu müşahidə TSSPlant proqramının kifayət qədər yüksək axtarış dəqiqliyinə dəlalət edir.**

***Açar sözlər:*** *Ali bitki, genom, gen, TATA-boks, promotor, TSS, kompüter analizi*

## GİRİŞ

Hazırda, insan, gəmiricilər və meymunlar da daxil olmaqla, genomların oxunması üzrə doqquz yüzə yaxın layihə vardır (http://www.ncbi.nlm.nih.gov/genomes/leuks.cgi) və hazırda nukleotid ardıcıllığı məlum olan genomların quruluş və funksiya baxımından annotasiyası nəzəri və praktiki baxımdan ən aktual məsələlərdən biridir.

Genom annotasiyasının mühüm problemlərindən biri promotorların müəyyənləşdirilməsidir. Lakin bu gün genom ardıcıllıqlarında promotorların tapılması sadə məsələ deyildir. Promotor ardıcıllıqlarının gen-səciyyəvi arxitekturası və bu sahədə mövcud biliklərin məhdud olması onların axtarışı üçün ümumi strategiyanın yaradılmasını müşkül problem edir. Genom nahiyyələrinin transkripsiyasını tənzimləyən transkripsiya faktorlarının (TF) qısa (5-15 nukleotid cütü, nc) nukleotid ardıcıllıqlarından ibarət birləşmə saytları (TFBS) əsasən promotorlarda yerləşir. Hər bir promotor belə tənzimləyici elementlərin unikal tərkibi ilə səciyyələnir ki, bu da özünəməxsus gen ekpressiyasını müəyyən edir. Eukariotlarda zülal kodlaşdıran genlərin və həmçinin bəzi kiçik RNT genlərinin transkripsiyası RNT II polimeraza (Pol II) vasitəsilə həyata keçirilir. Transkripsiyanın start saytının (TSS) daxil olduğu Pol II promotor nüvəsi (“*core promoter*) TSS-na (+1) nəzərən -60:+40 rayonunu əhatə edir. Həmin nüvədən əvvəl yerləşən 200-300 nc uzunluğundakı nahiyyə isə proksimal promotordur. Proksimal promotorda transkripsiyanın özünəməxsus qaydada tənzimlənməsi üçün tələb olunan çoxsaylı TFBS-ları yerləşir. Bundan başqa, promotorun proksimal promotordan əvvəldə yerləşən distal hissəsində də TFBS-ları (enhanserlər, saylenserlər, insuleytorlar) vardır (Hebing et al., 2015; Geetu et al., 2014; Tak-Ming et al., 2012; Fred et al., 2016.).

Heyvan və bitki orqanizmlərinin promotorlarının təxminən 30-50%-ində TSS-dan 25-45 nc məsafəsində yerləşən və TATA-boks adlanan element vardır - bu promotorlar TATA-promotor adlanır. Eukariot promotorlarında indiyədək aşkar edilmiş ən konservativ element TATA-boks yüksək dərəcədə ekspressiya olunan genlərin çoxunun promotorunda vardır (Smale et al., 2003; Butler et al., 2002; Lemon et al., 2001; Sandelin et al., 2007; Zuo et al., 2011).

Lakin bir çox gen qruplarında (məsələn, “ev təsərrüfatı genləri; *housekeeping genes*) TATA-boks yoxdur - belə promotorlar qeyri-TATA (*TATA-less*) promotorlar adlanır. Bu tip promotorlarda TSS-nın mövqeyi CpG adaları və/ya “inisiasiya elementi” (*initiator element*), Inr, və/ya DPE (*downstream promoter element*) vasitəsilə tənzimlənir (Suzuki et al., 2001; Cooper et al., 2006; Xu et al., 2016).

İndiyədək tədqiq olunmuş promotorların əksəriyyətində çoxsaylı, alternativ TSS-lər aşkar olunmuşdur (Suzuki et al, 2001; Carninci et al., 2006; Taylor et al. 2006; Davuluri et al., 2008). TSS-ları əksər hallarda gen başlanğıcından əvvəldə yerləşsə də, onlara genlərin “daxilində” - transkripsiya olunan hissələrdə olması da nadir hadisə deyildir (Koch et al, 2008; Shahmuradov et al., 2016).

Hazırda bitkilərin təcrübi yolla müəyyənləşdirilmiş 2 tip promotor (TSS) kolleksiyaları mövcuddur.

1) Tam uzunluqlu komplementar DNT ( TU-kDNT; *full-length cDNA, FL-cDNA*) ardıcıllıqlarının genom ardıcıllıqları ilə müqayisəsi əsasında muəyyənləşdırılən kolleksiyalar; məsələn, RARGE DB (Sakurai et al., 2005; Akiyama et al., 2014) və ppdb (Yamamoto et al., 2008; Hieno et al., 2014).
2) TSS da daxil olmaqla, promotor dəstləri birbaşa təcrübi yollarla müəyyənləşdirilmiş kolleksiyalar; məsələn, EPD (Dreos et al., 2013, 2015), PlantProm DB (Shahmuradov et al., 2003).

Birinci tip bazalar içərisində ppdb ən böyük məlumat resursudur. Bu bazanın son buraxılışında (versiya 3.0; Hieno et al., 2014; http://ppdb.agr.gifu-u.ac.jp/ppdb/cgi-bin/index.cgi) kəsəkotu (*Arabidopsis thaliana*), duyü (*Oryza sativa*), qovaq (*Populus trichocarpa*) və mamır (*Physcomitrella patens*) bitkilərindən on minlərlə Pol II promotorları üzrə məlumat toplanmışdır. O cümlədən, bu bazada kəsəkotunun zülal kodlaşdıran genlərinin hamısı (27206) və duyunün annotasıya olunmuş 32325 zülal kodlaşdıran genindən 12535 gen üçün TSS məlumatı vardır Digər tərəfdən, bizim analiz aşkar etmişdir ki, kəsəkotunun və düyünun müvafiq surətdə 7878 (~29%) və 1554 (~13%) geni üçün xəritələşdırilmiş TSS ılə müvafiq genin kodlaşdıran DNT ardıcıllığının (KDA; *coding DNA sequences CDS*) annotasıya olunmuş başlanğıc nöqtəsi arasındakı məsafə, d(TSS,KDA), 10 nc-dən azdır. Məlumdur ki, TSS və KDA başlanğıcı arasındakı nahiyyə - 5'-translyasiya olunmayan rayon (TOR; untranslated region, UTR) rıbosomların mRNT ilə bırləşməsi translyasiyanı həyat keçirməsı üçün tələb olunur. İndiyədək 5'-TOR-un minimum uzunluğu məlum olmasa da, belə hesab olunur ki, translyasiyanın düzgün və tələb olunan səviyyədə getməsi üçün həmin rayonun uzunluğu, ən azı, 20 nukleotid olmalıdır (Chen et al., 2011; Kim et al., 2014, Hinnebusch et al., 2016). Bu halda belə nəticə hasil olur ki, ppdb bazasında minlərlə gen üçün TSS məlumatları yeni təcrübələrlə dəqiqləşdırilməlidir.

İkinci tip bazalar içərisində ilk buraxılışı 2003-cü ildə təqdim olunmuş PlantProm DB həm tərkibindəki TSS-larının ümumi sayına, həm də toplanmış məlumatların təhlilolunma aspektlərinə görə ən böyük resursdur. Bu bazanın hazırki buraxılışı 86 bitki növündən hər bir TSS üçün ayrılıqda birbaşa təcrübə vasitəsi ilə muəyyənləş-dirilmiş və çap olunmuş məqalə ilə təsbit olunmuş 576 TSS üzrə məlumatlar toplanmışdır (Shahmuradov et al, 2012; http://www.softberry. com/plantprom2016/).

Bu uğurlara baxmayaraq, bıtkilərin təcrübi yolla müəyyənləşdirilmiş promotor kolleksiyaları bitki promotorlarının çox kiçik bir hissəsini təşkil edır. Ümumiyyətlə, TSS-larının təcrübi yolla müəyyənləşdirilməsi hələ də bahalı və çətin prosesdir. Bu səbəbdən kompüter analizı vasıtəsi ilə TSS-larının aşkar edilməsi səmərəli yanaşma olaraq qalır (Mundade et al., 2014; Suryamohan et al., 2015; Levati et al., 2016).

Son 20 ildə promotorların (TSS-larının) axtarışı üzrə bir sıra kompüter proqramları yaradılmışdır, o cümlədən: EP3 (Abeel et al., 2008), TSSP-TCM (Shahmuradov et al., 2005), TSSP (http://www.softberry.com/berry.phtml?topic=tssp&group=programs&subgroup=promoter), PromPredict (Rangannan et al., 2009; Morey et al., 2011). Bu yaxınlarda bitkilərin Pol II promo-torlarının axtarışı üzrə yeni bir proqram, TSSPlant, yaradılmışdır (Shahmuradov et al., 2017). Həmin proqram bu sahədə indıyədək yaradılmış dıgər proqramlarla müqayisədə ən yüksək axtarış dəqiqliyi ilə səciyyələnır.

Təqdim olunan işin əsas məqsədi birləpəli və ikiləpəli bitkılərin bəzi nümayəndələrinin (cəmi 7 növün) plastid və mıtoxondrı təyinatlı zülal kodlaşdıran nüvə genlərinin və onların potensial TSS xəritələrinin kompüter vasitəsi ilə müəyyənləşdirilməsi olmuşdur. Aşağıda həmin araşdırmaların nəticələrı verilir və müzakirə olunur.

## MATERİAL VƏ METODLAR

Ali bitki genomunda güman edilən promotorların (TSS-larının) axtarışı üçün 7 bitki növünün nüvə genomunun annotasıyasından istifadə edilmişdir (http://plants.ensembl.org/info/website/ftp/index.html): birləpəli düyü (*Oryza sativa*, 35655 gen; genom assembleyası IRGSP-1.0) və qarğıdalı (*Zea mays*; 36988 gen; genom assembleyası AGPv3), ıkiləpəli kəsəkotu (*Arabidopsis thaliana*; 27201 gen; genom assembleyası TAIR10), qara yonca (*Medicago truncatula*; 47202 gen; genom assembleyası MedtrA17 4.0), qovaq ağacı (*Populus trichocarpa*; 38449 gen; genom assembleyası JGİ2.0), şərab üzümü (*Vitis vinifera*; 26118 gen; genom assembleyası İGGP 12x) və soya (*Glycine max*; 53151 gen genom assembleyası; v1 0). Analiz üçün, getseqPP kompüter proqramından (Shahmuradov, çap olunmamışdır) istifadə etməklə, annotasiya olunmuş zülal ardıcıllıqları və müvafiq genlərin [-1000: +101] rayonları (+1: genin start nöqtəsi) götürülmüşdür. Promotor axtarışı üçün yalnız uzunluğu 20 nc və daha çox olan 5'-TOR ilə annotasiya olunmuş zülal kodlaşdıran genlər seçilmişdir; bir neçə başlanğıc nöqtəsı annotasiya olunmuş genlər üçün ən uzun 5'-TOR-a uyğun başlanğıc nöqtəsi götürülmüşdür.

Genomda gen duplikasiyaları nəticəsində bir neçə nüsxə ilə təmsil olunan genlərdən və muvafiq zülallardan yalnız biri seçilmişdir. Bu məqsədlə əvvəlcə zulalların və müvafiq genlərin promotor nahiyyələrinin BLAST proqram paketi (Altschul et al., 2004) vasitəsi ilə növdaxili cüt cüt müqayisəsi aparılmış və daha sonra BLAST nəticələrı BLAN və getseqPP (Şahmuradov, çap olunmamışdır) kompüter proqramlarının köməyi ilə təhlıl edılmiş, tam uzunluqlu və oxşarlıq dərəcəsi 90%-dən aşağı olmayan ardıcıllıqlardan yalnız bırı götürülmüşdür Nəticədə, *O. sativa*, *Z. mays*, *A. thaliana*, *M. truncatula*, *P. trichocarpa*, *V. vinifera* və *G. max* bıtkilərindən müvafiq surətdə 22258, 23330, 17896, 18226, 17645, 11035 və 38702 zülal və promotor ardıcıllıqları seçilmişdir.

TSS-larının axtarışı Şahmuradov, Umarov və Solovyov tərəfindən bu yaxınlarda yaradılmış TSSPlant kompüter proqramı (www.cbrc.kaust.edu.sa/download/files/TSSPlant linux.tar.gz) vasitəsi ilə aparılmışdır.

Zülalların mümkun təyinat yerləri ProtComp proqramının vasitəsi ilə müəyyənləşdırilmişdir (http://www.softberry.com/berry.phtml?topıc=protcomppl&group=programs&subgroup=proloc).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

***Plastid və mitoxondri təyinatlı genlərin proqnozlaşdırılması.*** *O sativa*, *Z. mays*, *A. thaliana*, *M. truncatula*, *P. trichocarpa*, *V. vinifera* və *G. max* bitkılərindən 149092 zülal ardıcıllığı ProtComp kompüter proqramı vasitəsi ilə analiz edilmişdir və hər növ üçün potensıal plastıd və mitoxondrı təyinatlı zülal ardıcıllıqları dəstləri müəyyənləşdirilmişdir. Kəsəkotunda 3997 plastid və 1533 mıtoxondri; soyada 5256 plastid və 2339 mitoxondri; qara yoncada 3759 plastid və 1569 mitoxondri, qovaq ağacında 3215 plastid və 1307 mıtoxondri, şərab üzümündə 2093 platid və 832 mitoxondri, düyüdə 4525 plastid və 1761 mitoxondri, qarğıdalıda 5159 plastid və 1933 mitoxondri təyinatlı nüvə genləri aşkar edilmişdir (Cədvəl 1). Bu analizin maraqlı nəticələrindən biri tranzit peptidlərinə görə plastidlərə yaxud mitoxondrilərə ünvanlanması güman edilən zülalların ümumi sayı üzrə növlərarası böyük fərq müşahidə olunur. Çox güman ki, müşahidə olunan fərq müxtəlif növlərdə annotasiya olunmuş genlərın (zülalların) sayında olan fərqlə bağlıdır. Lakin həmin fərq hər bir növün özunəməxsus xususiyyətləri ilə də bağlı ola bilər. Hazırda bu istiqamətdə araşdırmalarımız davam edir.

***Potensial transkripsiya start saytlarının müəyyənləşdirilməsi.*** TSSPlant proqramının köməyi ilə 7 bitkı növündən 149092 genin hər birinın 5'-nahiyyəsində ən azı bir potensial promotor (TSS) aşkar edilmişdir Aşkar olunmuş promotorlar həm bütun genlər üzrə, həm də ayrıca olaraq plastid və mitoxondrı təyınatlı genlər üzrə müqayisəlı təhlil olunmuşdur. Alınmış nəticələrin əsas inteqral məqamları Cədvəl 1-də verılmışdır. Bu analizin məqamları

**Cədvəl 1.** 7 alı bıtkının zülal kodlaşdıran nuvə genlərinın potensıal transkrıpsıya start saytları üzrə ümumı statıstık göstərıcılər

| Orqanizm | Zülal genləri dəsti | Dəstdəki genlərin sayı | TATA promotorlar | Qeyri-TATA promotorlar | TATA/qeyri-TATA, % |
|---|---|---|---|---|---|
| *A.t.* | Bütün genlər | 17896 | 5534 | 12362 | 30.9/69.1 |
| | Plastıd təyinatlı | 3994 | 1266 | 2728 | 31.7 68.3 |
| | Mıtoxondrı təyınatlı | 1532 | 469 | 1063 | 30.6/69 4 |
| *G m.* | Bütün genlər | 38702 | 5833 | 32896 | 15.1/84.9 |
| | Plastıd təyinatlı | 5252 | 669 | 4583 | 12.7 87.3 |
| | Mıtoxondrı təyinatlı | 2339 | 332 | 2007 | 14 2 85.8 |
| *M.t.* | Bütün genlər | 18226 | 3600 | 14626 | 19.8/80.2 |
| | Plastıd təyinatlı | 3759 | 657 | 3102 | 17.5/82.5 |
| | Mıtoxondrı təyinatlı | 1569 | 268 | 1301 | 17 1 82 9 |
| *P.t.* | Butün genlər | 17645 | 4016 | 13629 | 22.8/77.2 |
| | Plastid təyinatlı | 3215 | 623 | 2592 | 19.4/80 6 |
| | Mıtoxondrı təyinatlı | 1307 | 264 | 1043 | 20 2/79 8 |
| *V v* | Bütün genlər | 11035 | 2999 | 8036 | 27.2/72.8 |
| | Plastıd təyınatlı | 2083 | 467 | 1616 | 22 4/77 6 |
| | Mıtoxondrı təyinatlı | 829 | 201 | 628 | 24 2/75.8 |
| *O.s.* | Bütün genlər | 22258 | 7457 | 14801 | 33.5 66.5 |
| | Plastıd təyınatlı | 4508 | 1310 | 3198 | 29.1/70 9 |
| | Mıtoxondrı təyınatlı | 1756 | 519 | 1237 | 29.6/70.4 |
| *Z m.* | Bütün genlər | 23330 | 8949 | 14381 | 38.4/61.6 |
| | Plastid təyinatlı | 5137 | 1825 | 3312 | 35.5/64.5 |
| | Mıtoxondrı təyınatlı | 1921 | 681 | 1240 | 35 5 64.5 |

*A.t. Arabıdopsıs thalıana; M t Medıcago truncatula, P t Populus trıchocarpa: G m – Glycine max, V v. – Vıtıs vınifera, O s – Oryza satıva, Z m – Zea mays.*

Cədvəl 1-də verilmişdir. Bu analizin aşkar etdiyi ümumi və maraqlı fakt odur ki, tədqiq olunmuş orqanizmlərin hamısında həm bütün genlər, həm də yalnız plastid yaxud mitoxondri təyinatlı genlərdə qeyri-TATA tipli promotorlar aşkar üstünlük təşkil edirlər.

Daha sonra, hər bir orqanizm üçün ayrılıqda həm bütün genlər, həm də yalnız plastid və mitoxondri təyinatlı genlər üzrə aşkar edilmiş potensial TSS-ları ilə müvafiq genlərin annotasiya olunmuş gen başlanğıcı arasındakı məsafələr hər iki promotor sinfi (TATA və qeyri-TATA) üzrə birlikdə və ayrı-ayrılıqda təhlil olunmuşdur (**Cədvəl 2, 3, 4**). Əlavə olaraq, nümunə kimi, şəkil 1-də bütün genlər üzrə qeyd olunan məsafələrin paylanma histoqramı da verilir.

Hər bir gen üçün annotasiya olunmuş gen başlanğıcına ən yaxın TSS götürülməklə, TSSPlant vasitəsi ilə tapılmış potensial TSS (TSSp) və gen başlanğıcı arasındakı məsafə hesablanmışdır: analiz olunmuş genlərin ~51,2%-ində potensial TSS annotasiya olunmuş gen başlanğıcının yaxınlığında (<50 nc məsafədə) yerləşir; TSSp və gen başlanğıcı arasında məsfafə 100 nc dən çox olmayan genlər isə bütün genlərin ~70%-ini təşkil edir. O cümlədən, genlərin annotasiya olunmuş başlanğıcı ətrafında (≤50 nc məsafədə):

- bütün genlər üzrə, kəsəkotunda 10355, soyada 20202, qara yoncada 10477, qovaq ağacında 8222, şərab üzümündə 4970, düyüdə 11827 və qarğıdalıda 11993 TSS aşkar olunmuşdur;
- plastid təyinatlı genlər üzrə, kəsəkotunda 2268, soyada 2701, qara yoncada 2197, qovaq ağacında 1444, şərab üzumundə 928, düyüdə 2411 və qarğıdalıda 2658 TSS aşkar olunmuşdur;
- mitoxondri təyinatlı genlərdə kəsəkotunda 871, soyada 1183, qara yoncada 898, qovaq ağacında 586, şərab üzümündə 376, düyüdə 936 və qarğıdalıda 986 TSS aşkar edilmişdir.

Bu nəticələr göstərir ki, TSSPlant proqramı vasitəsi ilə müəyyənləşdirilmiş potensial TSS-ları əksər hallarda annotasiya olunmuş gen başlanğıcı ətrafında yerləşir. Potensial TSS-larının annotasiya başlanğıcından nisbətən uzaqda yerləşdiyi hallar ilə bağlı qeyd etmək lazımdır ki, istifadə olunmuş genom annotasiyalarında genləri başlanğıcı mRNT (transkriptom) məlumatlarının məhdudluğu üzündən bir çox hallarda dəqiq deyildir.

**Cədvəl 2**. 7 ali bitkinin zülal kodlaşdıran nüvə genlərinin annotasiya olunmuş başlanğıc noqtəsi ilə həmin başlanğıca ən yaxın potensial TSS arasındakı məsafə üzrə ümumi statistik göstəricilər (bütün genlər üçün)

| **Orqanizm** | **Promotor sinfi** | **Potensial TSS və annotasiya olunmuş genin başlanğıcı arasındakı məsafə, nc** | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | **0-50** | **51-100** | **101-200** | **201-400** | **401-600** | **> 600** |
| *A.t.* | cəmi | 10355 | 2447 | 3474 | 1583 | 28 | 9 |
| | TATA | 3489 | 688 | 907 | 421 | 22 | 7 |
| | qeyri-TATA | 6866 | 1759 | 2567 | 1162 | 6 | 2 |
| *G.m* | cəmi | 20202 | 5470 | 8902 | 4075 | 40 | 13 |
| | TATA | 4084 | 596 | 787 | 347 | 18 | 1 |
| | qeyri-TATA | 16118 | 4874 | 8115 | 3728 | 22 | 12 |
| *M.t* | cəmi | 10477 | 2361 | 3610 | 1760 | 15 | 3 |
| | TATA | 2578 | 377 | 461 | 175 | 8 | 1 |
| | qeyri-TATA | 7899 | 1984 | 3149 | 1585 | 7 | 2 |
| *O.s* | cəmi | 11827 | 2745 | 4351 | 2853 | 309 | 173 |
| | TATA | 3986 | 759 | 1436 | 1070 | 139 | 67 |
| | qeyri-TATA | 7841 | 1986 | 2915 | 1783 | 170 | 106 |
| *P.t* | cəmi | 8222 | 2447 | 4526 | 2392 | 50 | 8 |
| | TATA | 2632 | 433 | 609 | 321 | 17 | 4 |
| | qeyri-TATA | 5590 | 2014 | 3917 | 2071 | 32 | 4 |
| *V.v* | cəmi | 4970 | 1497 | 2654 | 1688 | 148 | 78 |
| | TATA | 1724 | 359 | 487 | 316 | 76 | 37 |
| | qeyri TATA | 3246 | 1138 | 2167 | 1372 | 72 | 41 |
| *Z.m* | cəmi | 11993 | 2713 | 4751 | 3169 | 483 | 221 |
| | TATA | 4428 | 937 | 1894 | 1357 | 229 | 104 |
| | qeyri-TATA | 18995 | 1776 | 2857 | 1812 | 254 | 117 |

*A.t. – Arabidopsis thaliana, M.t. – Medicago truncatula, P.t. – Populus trichocarpa, G.m – Glycine max, V.v. – Vitis vinifera, O.s. – Oryza sativa, Z.m. – Zea mays*

**Cədvəl 3** 7 alı bitkinin zülal kodlaşdıran nüvə genlərinin annotasiya olunmuş başlanğıc nöqtəsi ilə həmin başlanğıca ən yaxın potensial TSS arasındakı məsafə üzrə ümumı statıstık göstəricilər (yalnız plastıd təyinatlı genlər üçün)

| Orqanizm | Promotor sinfi | Potensial TSS və annotasiya olunmuş genin başlanğıcı arasındakı məsafə, nc | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | 0-50 | 51-100 | 101-200 | 201-400 | 401-600 | > 600 |
| *A.t.* | cəmı | 2268 | 592 | 765 | 360 | 5 | 4 |
| | TATA | 755 | 187 | 219 | 98 | 3 | 4 |
| | qeyri-TATA | 1513 | 405 | 546 | 262 | 2 | 0 |
| *G m* | cəmı | 2701 | 734 | 1267 | 546 | 3 | 1 |
| | TATA | 431 | 79 | 110 | 46 | 3 | 0 |
| | qeyri TATA | 2270 | 655 | 1157 | 500 | 0 | 1 |
| *M.t* | cəmı | 2197 | 486 | 727 | 343 | 6 | 0 |
| | TATA | 442 | 85 | 84 | 43 | 3 | 0 |
| | qeyri-TATA | 1755 | 401 | 643 | 300 | 3 | 0 |
| *O s* | cəmı | 2411 | 536 | 899 | 584 | 54 | 24 |
| | TATA | 660 | 123 | 283 | 209 | 27 | 8 |
| | qeyri TATA | 1751 | 413 | 616 | 375 | 27 | 16 |
| *P t* | cəmı | 1444 | 483 | 856 | 417 | 12 | 3 |
| | TATA | 401 | 80 | 101 | 36 | 3 | 2 |
| | qeyri-TATA | 1043 | 403 | 755 | 381 | 9 | 1 |
| *V.v.* | cəmı | 928 | 290 | 503 | 325 | 13 | 14 |
| | TATA | 261 | 58 | 74 | 57 | 8 | 9 |
| | qeyri TATA | 667 | 232 | 429 | 268 | 15 | 5 |
| *Z m* | cəmı | 2658 | 596 | 1067 | 701 | 72 | 43 |
| | TATA | 844 | 221 | 415 | 296 | 68 | 19 |
| | qeyri-TATA | 1814 | 375 | 652 | 405 | 42 | 24 |

*A t. – Arabıdopsıs thalıana; M t – Medıcago truncatula, P t – Populus trıchocarpa; G m – Glycıne max, V.v. – Vitıs vinifera, O.s. – Oryza sativa, Z.m. – Zea mays*

**Cədvəl 4**. 7 alı bitkının zülal kodlaşdıran nüvə genlərinın annotasıya olunmuş başlanğıc noqtəsı ılə həmin başlanğıca ən yaxın potensıal TSS arasındakı məsafə üzrə ümumi statıstik göstəricilər (yalnız mitoxondri təyinatlı genlər üçün)

| Orqanizm | Promotor sinfi | Potensial TSS və annotasiya olunmuş genin başlanğıcı arasındakı məsafə, nc | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | 0-50 | 51-100 | 101-200 | 201-400 | 401-600 | > 600 |
| *A.t* | cəmi | 871 | 215 | 296 | 146 | 4 | 0 |
| | TATA | 277 | 64 | 84 | 40 | 4 | 0 |
| | qeyrı-TATA | 594 | 151 | 212 | 106 | 0 | 0 |
| *G m* | cəmi | 1183 | 361 | 529 | 262 | 3 | 1 |
| | TATA | 219 | 33 | 53 | 25 | 2 | 0 |
| | qeyrı-TATA | 964 | 328 | 476 | 237 | 1 | 1 |
| *M.t* | cəmi | 898 | 208 | 305 | 157 | 1 | 0 |
| | TATA | 184 | 25 | 38 | 21 | 0 | 0 |
| | qeyrı-TATA | 714 | 183 | 267 | 136 | 2 | 0 |
| *O s* | cəmi | 936 | 196 | 346 | 236 | 33 | 9 |
| | TATA | 247 | 50 | 109 | 92 | 17 | 4 |
| | qeyrı-TATA | 689 | 146 | 237 | 144 | 16 | 5 |
| *P t* | cəmi | 586 | 212 | 344 | 163 | 2 | 0 |
| | TATA | 174 | 32 | 42 | 16 | 0 | 0 |
| | qeyrı-TATA | 412 | 80 | 302 | 147 | 2 | 0 |
| *V v* | cəmi | 376 | 116 | 179 | 139 | 15 | 4 |
| | TATA | 115 | 19 | 32 | 26 | 8 | 1 |
| | qeyrı-TATA | 261 | 97 | 147 | 113 | 7 | 3 |
| *Z.m* | cəmi | 986 | 251 | 385 | 251 | 30 | 18 |
| | TATA | 309 | 87 | 160 | 105 | 12 | 8 |
| | qeyri TATA | 677 | 164 | 225 | 146 | 18 | 10 |

*A t. Arabıdopsıs thalıana, M.t Medicago truncatula, P t Populus trıchocarpa G.m Glycine max, V v Vitıs vinifera, O s. Oryza satıva, Z.m Zea mays*




**Şəkil 1.** Soya bıtkısının annotasiya olunmuş bütün nüvə genlərinin başlanğıcı ılə ona ən yaxın guman olunan TSS arasındakı məsafələrın TATA və qeyrı-TATA sınıfləri üzrə ayrı-ayrılıqda və bırlikdə paylanması.




**Şəkil 2**. Kəsəkotu bitkısinin tərkıbındə pentatrıkopeptıd təkrarları olan zülalı kodlaşdıran AT4G21705 genının məlum və güman olunam TSS-larının annotasiya olunmuş gen başlanğıcına və bır-bırinə nəzərən yerləşməsinin sxemı. TSS-larının xromosom koordinatları TAIR *A.thaliana* ver6.0 genom annotasiyasına uyğundur. "Naməlum": promotor sınfi məlum deyildır

Əksər genlər üçün birdən çox potensial TSS-nın tapılması faktı əksər genlərin transkrıpsiyasının çoxsaylı alternativ promotorlardan (TSS-larından) həyata keçirilməsi ilə bağlı təcrübi faktlarla uzlaşır (Davuluri et al., 2008). Məsələn, kəsəkotu bitkisinin tərkibində pentatrikopeptid təkrarları olan zülalı kodlaşdıran AT4G21705 genində təcrübi yolla 4 TSS müəyyənləşdirilmişdir (Lurin et al., 2004). Bizim TSSPlant analizımız ısə həmin genın promotor nahiyyəsində 3 potensial TSS aşkar etmişdir. Həmın təcrubi və potensıal TSS-larının bır-bırinə nəzərən yerləşməsinin müqayisəsi (şəkil 2) TSSPlant proqramının axtarış dəqiqliyi yuksəkdır.

## MİNNƏTDARLIQ

Bu iş Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun maliyyə yardımı ilə yerinə yetirilmişdır Qrant № EIF/GAM-3-2014-6(21)-24/16/3.

## ƏDƏBİYYAT


**Abeel T., Saeys Y., Bonnet E., Rouze P., van de Peer Y.** (2008) Generic eukaryotic core promoter prediction using structural features of DNA. *Genome Res.*, **18:** 310 23.

**Altschul S.F., Madden T.L., Schäffer A.A., Zhang J., Zhang Z., Miller W., Lipman D.J.** (1997) Gapped BLAST and PSIBLAST: a new generation of protein database search programs. *Nucl. Acids Res.*, **25:** 3389-3402.

**Akiyama K., Kurotani A., Iida K., Kuromori T., Shinozaki K., Sakurai T. (2014)** RARGE II: an integrated phenotype database of Arabidopsis mu tant traits using a controlled vocabulary. *Plant Cell Physiol;* **55(1):** e4.

**Butler J.E.Ş Kadonaga J.T.** (2002) The RNA polymerase II core promoter: a key component in the regulation of gene expression. *Genes Dev.*, **16:** 2583 2592.

**Cooper S.J. Trinklein N.D., Anton E.D. et al.** (2006) Comprehensive analysis of transcriptional promoter structure and function in 1% of the human genome. *Genome Res.*, **16:** 1-10.

**Carninci P., Sandelin A., Lenhard B. et al.** (2006) Genome-wide analysis of mammalian promoter architecture and evolution. *Nat. Genet.*, **38:** 626-635.

**Chen Ch., Lin Hy., Pan C.L., Chen F. C.** (2011) The genomic features that affect the lengths of 5' untraslated regions in multicellular eukariotes. *BMC Bioinformatics.* **12 Suppl 9:** S3.

**Davuluri R.V., Suzuki Y., Sugano S., Plass C., Huang T.H.** (2008) The functional consequences of alternative promoter use in mammalian genomes. *Trends Genet.*, **24:** 167-177.

**Dreos, R., Ambrosini, G., Périer, R., Bucher, P.** (2013) EPD and EPDnew, high-quality promoter resources in the next-generation sequencing era. *Nucl. Acids Res.*, **41:** D157 D164.

**Dreos R., Ambrosini G., Périer, R., Bucher, P.** (2015) The Eukaryotic Promoter Database: expansion of EPDnew and new promoter analysis tools. *Nucl. Acids Res.* **43:** D92-D96.

**Fred Y.P., Zhiqiu H., Rong-Cai Y.** (2016). Bioinformatic prediction of transcription factor binding sites at promoter regions of genes for photo period and vernalization responses in model and temperate cereal plants. *BMC Genomics.* **17:** 573.

**Geetu T., Karen Betancourt M., Tisha C., Jenny C., Aaron M.W., Gill B.** (2014) Automated discovery of tissue-targeting enhancers and transcription factors from binding motif and gene func tion data. *PLoS Comput Biol.*, **10(1):** e1003449.

**Hieno A., Naznin H.A., Hyakumachi M., Sakurai T., Tokizawa M., Koyama H. et al.** (2014) ppdb: plant promoter database version 3.0. *Nucl. Acids Res.*, **42:** D1188 D1192.

**Hebing C., Hao L., Feng L., Xiaofei Z., Shengqi W., Xiaochen B., Wenjie S.** (2015) An integrative analysis of TFBS-clustered regions reveals new transcriptional regulation models on the accessible chromatin landscape. *Sci. Rep.*, **5:** 8465.

**Hinnebusch A.G., Ivanov I., Sonenberg N.** (2016) Translational control by 5'-untranslated regions of eukariotic mRNAs. *Sciense* **352(6292):** 1413-1416.

**Kim Y., Goeun L., Eunhyun J. et al.** (2014) The immadiate upstream region of the 5'-UTR from the AUG start codon has a pronounced effect on the trabslational efficiency in *Arabidopsis thaliana. Nucleic acid Res.* **42(1):** 485-498.

**Koch F., Jourquin F., Ferrier P., Andrau J-C.** (2008) Genomewide RNA polymerase II: not genes only! *TIBS,* **33:** 265-273.

**Lemon B., Tjian R.** (2000) Orchestrated response: a symphony of transcription factors for gene control. *Genes Dev.*, **14:** 2551-2569.

**Levati E., Sartini S., Ottonello S., Montanini B.** (2016) Dry and wet approaches for genome-wide functional annotation of conventional and uncon ventional transcriptional activators. *Comput. Struct. Biotechnol. J.*, **14:** 262 270.

**Lurin C., Andrés C., Aubourg S., Bellaoui M., Bitton F., Bruyère C., Caboche M., Debast C., Gualberto J., Hoffmann B. et al.** (2004) Genome-wide analysis of *Arabidopsis* pentatricopeptide repeat proteins reveals their essential role in organelle biogenesis. *Plant Cell.*, **16:** 2089 2103.

**Mundade R., Ozer H.G., Wei H., Prabhu L., Lu T.** (2014) Role of ChIP-seq in the discovery of transcription factor binding sites, differential gene regulation mechanism, epigenetic marks and beyond. *Cell Cycle*, **13:** 2847-2852.

**Morey C., Mookherjee S., Rajasekaran G., Bansal M.** (2011) DNA free energy-based promoter prediction and comparative analysis of *Arabidopsis* and rice genomes. *Plant Physiol.*, **156:** 1300-1315.

**Rangannan V., Bansal M.** (2009) Relative stability of DNA as a generic criterion for promoter prediction: whole genome annotation of microbial genomes with varying nucleotide base composition. *Mol. Biosyst.*, **5:** 1758 1769.

**Sakurai T., Satou M., Akiyama K., Iida K., Seki M., Kuromori T., Ito T., Konagaya A., Toyoda T., Shinozaki K.** (2005) RARGE: a large-scale database of RIKEN Arabidopsis resources ranging from transcriptome to phenome. *Nucleic Acids Res* **33:** D647-650.

**Shahmuradov I.A., Gammerman A.J., Hancock J.M., Bramley P.M., Solovyev V.V.** (2003) Plant Prom: a database of plant promoter sequences. *Nucl. Acids. Res.*, **31:** 114-117.

**Shahmuradov I.A., Solovyev V.V.** (2015) Nsite, NsiteH and NsiteM computer tools for studying

transcription regulatory elements. *Bioinformatics*, **31:** 3544-3545.

**Shahmuradov I.A., Solovyev, V.V., Gammerman A.J.** (2005) Plant promoter predıctıon wıth confidence estımatıon. *Nucl. Acids Res.*, **33:** 1069-1076.

**Shahmuradov I.A., Abdulazimova A.U., Khan F.Z., Solovyev V.V., Mustafayev N.Sh., Akbarova Y.Yu., Qamar R., Aliyev J.A.** (2012) The PlantProm DB: recent updates. In: *Proceedings of the 2012 International Conference on Biomedical Engineering and Biotechnology* (iCBEB), China, Macau, 612-614.

**Shahmuradov I.A., Mohammad R.R., Bougouffa A., Radovanovich A., Bajic V.B.** (2017) bTSSfinder: a novel tool for the prediction of promoters in Cyanobacteria and *Escherichia colı. Bioinformatics,* **33 (3):** 334-340

**Shahmuradov I.A., Umarov R.K., Solovyev V.V.** (2017) TSSPlant· a new tool for prediction of plant Pol II promoters. *Nucl Acıds Res*., **doi: 10.1093/nar/gkw1353.**

**Smale S.T., Kadonaga J.T.** (2003) The RNA polymerase II core promoter. *Annu. Rev. Biochem*., **72:** 449-479.

**Sandelin A.** (2007) Mammalian RNA polymerase II core promoters: insights from genome-wide studies. *Nature Reviews*, **8:** 424-436

**Suzuki Y. et al.** (2001) Identıfication and characterization of the potential promoter regions of 1031 kinds of human genes. *Genome Res.,* **11:** 677-684.

**Suryamohan K., Halfon M.S.** (2015) Identıfyıng transcriptional cis-regulatory modules in animal genomes. *Wiley Interdiscıp. Rev. Dev. Bıol.*, **4:** 59-84.

**Taylor M.S.** (2006) Heterotachy in mammalian promoter evolution. *PLoS Genet.*, **2:** e30

**Tak-Ming C., Kwong-Sak L., Kin-Hong L., Man-Hon W., Terrence C.K.L., Stephen K.W.T.** (2012) Subtypes of associated protein–DNA (Transcription Factor-Transcription Factor Binding Site) patterns. *Nucleic Acıds Res.*, **40(19):** 9392-9403.

**Xu M., Gonzalez-Hurtado E., Martinez E.** (2016) Core promoter-specific gene regulation: TATA box selectivity and Inıtiator dependent bi directio nality of serum response factor-activated transcription. *Bıochhım. Bıophys. Acta*, **1859(4):** 553-563.

**Yamamoto Y.Y., Obokata J.** (2008) ppdb: a plant promoter database. *Nucl Acids Res.*, **33:** D977-D981.

**Zuo Y.C., Li Q.Z.** (2011) Identification of TATA and TATA less promoters ın plant genomes by ıntefrating diversity measure, GC-skew and DNA geometric flexibilıty. *Genomıcs*, **97:** 112-120.

## Определение Потенциальных Сайтов Старта Транскрипции Белок-кодирующих Ядерных Генов в 7-и Высших Растениях

**Х.Ф. Кулиева, А.У. Абдулазимова, Н.Ш. Мустафаев, И.А. Шахмурадов**

*Институт молекулярной биологии и биотехнологий НАН Азербайджана*

С помощью компьютерной программы TSSPlant проведен поиск возможных сайтов старта транскрипции (ССТ) промоторов в [-1000:+101] районах (+1: аннотированное начало гена) 22,258, 23,330, 17,896, 18,226, 17,645, 38,702 и 11,035 (всего 149,092) белок-кодирующих генов, соответственно у *Oryza sativa* и *Zea mays* (однодольные*), Arabıdopsıs thaliana, Glycine max, Medicago truncatula, Populus trichocarpa* (двудольные) и *Vitis vinifera.* Для каждого гена найден, как минимум, один СС. Сравнительный анализ этих ССТ по классу промоторов для всех генов, в том числе, для пластидных и митохондриальных генов в отдельности, выявил, что у всех растений подавляющее большинство промоторов относится к не-TATA промоторам (~70%₀ не-TATA промоторы против ~30% TATA промоторы). Анализ расстояний между потенциальным TSSp и началом гена для всех изученных видов, показал, что при условии использования самого близкого к аннотированному началу гена ССТ, для 70% и больше генов это расстояние составляет менее 100 нуклеотидов. Последнее наблюдение указывает на достаточно высокую предсказательную точность программы TSSPlant.

***Ключевые слова:*** *Высшее растение, геном, ген, TATA-бокс, промотор, ССТ, компьютерный анализ*

# Identification Potential Transcription Start Sites of Protein Encoded Nuclear Genes in 7 Higher Plants

**H.F. Guliyeva, A.U. Abdulazimova, N.Sh. Mustafayev, I.A. Shahmuradov**

*Institute of Molecular Biology and Biotechnologies, Azerbaijan National Academy of Sciences*

Using the computer program TSSPlant, search for putative transcription start sites (TSS) promoters in [-1000:+101] regions (+1 is the annotated gene start) of 22,258, 23,330, 17,896, 18,226, 17,645, 38,702 and 11,035 (totally, 149,092) protein-coding genes from monocot *Oryza sativa* and *Zea mays*, dicot *Arabidopsis thaliana, Glycine max, Medicago truncatula, Populus trichocarpa* and *Vitis vinifera*, respectively, was performed. At least, one potential TSS for every gene was predicted. The comparative analysis of these TSSs by the promoter class for all genes, as well as for only plastid or mitochondrial genes revealed that in all plants TATA-less promoters prevail over the TATA-promoters (~70% TATA-less promoters vs ~30% TATA-promoters). Taking, for every gene, only the predicted TSS (TSSp) which is located closest to the annotated gene start, an analysis of distances between TSSp and gene starts showed that for 70% and more genes this distance is less than 100 bp. These findings indicate that the prediction accuracy of TSSPlant program is quite high.

***Keywords:*** *Higher plant, genome, gene, TATA-box, promoter, TSS, computational analysis*

# Arpanın Yetişməmiş Rüşeymlərindən İnduksiya Edilmiş Kallus və Morfogenez Proseslərinin Bəzi Xüsusiyyətləri

**S.Ş. Əsədova**[1,2]

[1]*AMEA Molekulyar Biologiya və Biotexnologiyalar Institutu, Mətbuat prospekti, 2A, Bakı AZ 1073, Azərbaycan*
[2]*Azərbaycan Kənd Təsərrüfatı Nazirlıyı Əkınçılık Elmı-Tədqiqat İnstitutu, Pırşağı qəsəbəsi, 2 saylı sovxoz, Bakı AZ1098, Azərbaycan, E-mail. biotexnoloqaz@mail.ru*

**Arpanın yerli seleksiya sortlarının süd və mum fazalarında təcrid edilmiş yetişməmiş rüşeymləri *in vitro* şəraitində eyni hormonal tərkibli qida mühitində kultivasiya edilmişdir. Eksplantlarda induksiya edilmiş kallus- və morfogenez proseslərinin xüsusiyyətləri öyrənilmişdir.**

***Açar sözlər:*** *Arpa bitkisi, in vitro, yetişməmiş rüşeym, kallus, morfogenez*

## GİRİŞ

Məlumdur ki,torpaq tipi və ıqlımı fərqli olan zonalarda taxıl bitkilərindən alınan məhsulun həcmi eyni olmur. Bu hal bir sıra səbəblərnən bağlıdır ki, bunlardan bıtkilərin genetik determinə olunmuş mübadilə proseslərinin xüsusiyyəti, becərilmə zonalarına uyğunlaşma dərəcəsi, aqrotexniki tədbirlərə cavabı və s. qeyd etmək olar. Azərbaycan torpaq-iqlım şəraitının müxtəliflıyi ilə seçılən dövlətdirvə Respublika üzrə arpanın orta məhsuldarlığı 20,0 25,8 s/ha təşkil edir (ARSK nın məlumatları, 2014). Müxtəlif torpaq-iqlim zonalarında arpanın məhsuldarlığına daır aparılmış monitorınq gostərdı kı, heyvandarlığın və qida sənayesinin tələbatlarını ödəmək üçün yüksək məhsuldar sortların yaradılması seleksionerlərin qarsısında duran vacib məsələlərdən biridir (Мамедов и др., 2010). Dünyanın bir çox elm mərkəzlərində bu məqsədə nail olmaq üçün seleksiyanın həm ənənəvi, həm də molekulyar-genetik və biotexnoloji üsullarından istıfadə edılir. Bıotexnologiya üsulları vasitəsilə bitkıdə gədən bir çox biokimyəvi və fizioloji proseslər ilin fəsilindən asılı olmadan öyrənilə bilər. Tədqiqin məvəffəqiyyətlə aparılması üçün əsas şərt regenerant bitkılərin stabıl alınmasıdır (Mano et al., 1994; Ковалева, 2000, Dahleen, Bregitzer, 2002).

Qeyd etmək lazımdır ki, taxıl bıtkılərinin içındə *in vitro* regenerasiyanın alınması nöqteyi-nəzərdən arpa ən çətin obyekt hesab olunur və bunun səbəbləri hələ də bəlli deyil. (Картель, Манешина, 1977; Исаева и др., 1980; Hanzel et al., 1985, Ковалева, 2000) Məlumdur ki, regenerasıya proseslərinə həm genotip, həm eksplant tipi, həm də süni qida mühitinın tərkibi təsir göstərırlər (Powell., Dunwell, 1987; Dahleen, Bregitzer, 2002; Əsədova, 2015; Бишимбаева и др., 2013).

Taxıl və arpa bitkiləri ilə aparılmış bir sıra tədqiqatlar kallusəmələgəlmə (Картель, Манешина, 1977; Исаева и др. 1980; Əsədova, 2015) və regenerasiya proseslərinin (Кушнаренко 1990; Лутова и др., 1994) genotıptən asılı olmasını təsdiq edirlər. Hətta regenerasiya tipinin də nə eksplantdan, nə də qida mühitinin tərkibindən asılı olmadığı göstərilib (Чернов, Пендинен, 2011). Bundan başqa, qeyd edılir ki, regenerasiyanın effektliyi eksplantın ölçüsündən asılı olsa belə, onun keyfiyyət göstəricisi genotipdən asılıdır (Ковалева, 2000; Чернов, Пендинен, 2011).

Lakin son illərdə aparılmış bir sıra tədqiqatlar becərilmə mühitinın üstünlüyünü göstərmişdilər. Belə ki, ədəbiyyat mənbələrində genotipin təsirini aradan qaldıran texnologiyanın işlənib hazırlanması haqqında informasıya verılmişdir (Бишимбаева и др., 2013). Genotiplərin arasında olan morfogenetik reaksıyalarının fərqi qida mühitinin fitohormonal tərkibinin dəyişməsi yolu ilə aradan qaldırılmışdır. Bu yanaşmanın ıstıfadəsi zamanıeyni morfogenetık reaksiyanı göstərən və regenerasiya qabiliyyətini uzun muddət saxlayan embriogen toxumaların alınması mümkünlüyü göstərilmişdır.

İn vitro texnologiyasında istifadə edilən eksplant tiplərinin effektivliyi haqqında da olan informasiya bir gədər ziddiyyətli xarakter daşıyır. Əvvəlki ıllərdə taxıl bıtkılərindən *in vitro* şəraitində regenerasiyanın alınması üçün yalnız yetişməmiş rüşüym və tozcuq kulturasından istifadə edılırdi (Foroughi Wehr, 1982; Breiman et al., 1985; Goldsteın, Kronstadt,1986; Ziauddin et al., 1990). Son zamanlar isə taxıl bitkilərinin, o cümlədən, arpanın müxtəlif orqanlarının toxumalarından embriogen kalluslar alınır (Дунаева и др., 2000; Dahleen, Bregitzer 2002; Ковалева, 2000; Чернов, Пендинен, 2011). Müəlliflər qeyd edirlər ki, ilkın kallusların alınması məqsədilə istifadə edilən eksplantların regenerasıya effektıvlıyi eksplantın ınkişaf mərhələsindən (optimal və ya qeyri-optimal) (Ковалева, 2000; Чернов, Пендинен, 2011) asılı-

dır və təcrübədən təcrübəyə dəyişə bilər (Лутова и др., 1994; Чернов, Пендинен, 2011). Göstərilmişdir ki, regenerasiyanın kamiyyət göstəricisi eksplant tipindən asılı deyil və bəzi eksplantlardan alınmış kallus kütlələrinin morfogenetik potensialı çox aşağı olur (Картель, Манешина, 1977; Исаева и др. 1980). Arpa genotiplərinin aşağı regenerasiya potensialı ilə xarakterizə olmasının səbəbi isə kallus toxumalarının çətin əmələgəlməsi və zəif proliferasiya etməsi ilə izah edilir (Кушнаренко, 1990; Лутова и др., 1994; Ковалева, 2000).

Yuxarıda deyilənləri nəzərə alaraq biz arpa sortlarının yetişməmiş rüşeymlərini süd və mum inkişaf mərhələlərində *in vitro* kulturaya daxil etməklə bu eksplantların kallus- və morfogenez xüsusiyyətlərinin öyrənilməsini məqsədəuyğun bilmişik.

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti kimi, Azərbaycanın Naxçıvandəni, Baxarlı, Sadlıq, Qarabaq 22, Qarabaq 7, Dəyanətli, Qarabaq 33, Qudrətli 48, Zəmi sortlarından istifadə edilmişdir.

Eksplant kimi *in vitro* kulturaya nümunələrin süd (1-ci variant) və mum (2-ci variant) inkişaf fazasında izolə olunmuş yetişməmiş rüşeymləri daxil edilmişdir.

Eksplantlar 5 dəqiqə ərzində 70 % etanol, 18 dəqiqə ərzində 5% natrium hipoxloritlə ardıcıl sterilizasiya ediləndən sonra, üç dəfə steril su ilə yuyulmuşdular (hər yuyulmada 1dəqiqə). Kallusların induksiyası üçün rüşeymlər 2 mq/l 2,4-dixlorfenoksisirkə turşusuəlavə edilmiş Qamborq ($B_5$) qida mühitində becərilmişdilər. Kultivasiya qaranlıqda, 26°C temperatur şəraitində aparılmışdır.

Morfogenezin induksiyasını əldə etmək üçün kalluslar 1 mq/l kinetin əlavə edilmiş Qamborq ($B_5$) qıda muhitinə əkilmişdılər. Becərilmə 26°C temperatur və işıqlanma şəraitində aparmışdır.

## NƏTICƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSI

Tədqiq etdiyimiz arpa genotiplərinin in vitro metodu vasitəsilə öyrənilməsi üçün regenerasiyanın stabil alınması şəraiti müəyyən olunmalıdır. Bu məqsədlə biz müxtəlif eksplantların kallus əmələgətirmə və regenerasiya effektliyini öyrənmək uçün in vitro kulturaya arpanın toxum (Асадова, Гарибов, 2016), yetişmiş rüşeym, etiolizə edilmiş cücərti (Əsədova, 2015; Əsədova, 2016) və hazırki işdə süd və mum inkişaf fazasında təcrid edilmiş yetişməmiş ruşeymlərini daxil etmişık.

Müşahidələr göstərdi ki, sortdan asılı olmayaraq mum mərhələsində inokulyasiya edilmiş rüşeymlərin kallus əmələgətirmə qabiliyyəti süd mərhələsinə nısbətən daha effektli idı. Tədqiqatın 2-ci variantında öyrənilən hər bir sortun eksplantları 5-7 gündən sonra proliferasiya edən kallus kütlələrini əmələ gətirirdilər. 1-ci variantda isə kallus toxumalarını Naxçıvandəni, Baxarlı, Sadlıq, Qarabaq 7, Dəyənətli, və Zəmi sortlarının eksplantlarından almaq mümkün oldu.30 gün ərzində aparılmış bəcərilmə müddətində Qarabaq 22, Qarabaq 33, Qudrətli 48 sortlarının süd mərhələsində inokulyasiya edilmiş rüşeymlərində kallus əmələ gəlməmişdir, yalnız bölünməyən ayrı-ayrı kallus hüceyrələri müşahıdə edılırdı. Əvvəlkı illərdə eksplant kimi yetişmiş rüşeym və toxumlardan istifadə etdıyimiz zaman həm Qarabaq 33,həm də Qudrətli 48 sortlarından kalluskulturası alınmışdır.Hətta Qudrətlı 48 sortu kallusogenez prosesının intensivliyi ilə seçilirdi (Əsədova, 2015.). Qarabaq 22 sortu ilkin eksperimentlərdə olduğu kimi hazırki təcrübədə də kallus əmələgətirmə nöqteyi-nəzərindən qeyri-perspektiv sort olmuşdur. Bu sortun ın vitro kulturada çoxaldılmasının çətinlıyini bəzi bıtkılərdə olduğu kimi, genotipin xüsusiyyəti ilə izah etmək olar (Картель, Манешина, 1977; Лутова и др., 1994).

Qarabaq 33 və Qudrətli 48 sortlarının süd mərhələsində izolə edilmış eksplantlarından kallus toxumalarının alınmaması faktı isə bəcərilmə mühitinin rüşeymlərin dedıfferensiasıyası üçün qeyrı-optımal olduğunu göstərir Qıda muhitinin hormonal tərkibinin bitkilərdə kallus əmələgəlmə prosesinə bilvasıtə təsirihaqqında ədəbıyyatda kifayət qədər məlumat var (Исаева и др.,1980; Hanzel et al., 1985; Лутова и др., 1994; Mano et al., 1994; Dahleen, Bregitzer, 2002). Hətta kallus induksiyası zamanı istifadə edilən 2,4-D-nin normal regenerant bitkilərin alınmasında öynadığı rolu haqqında informasiya mövcuddur (Powell, Dunwell, 1987; Асадова, 2002; Бишимбаева и др., 2013).

Bizim tədqiqatda aldığımız morfogenez qabiliyyətli kallus kütlələrinin strukturu ilk əvvəl bərk olub, morfogenezin induksiyası zamanı isə tədricən yumsalırdı, bəzi kalluslarda isə hüceyrələrin zəif sulanması müşahıdə edilirdi (Şəkil 1-1).

Morfogenezin induksiyası zamanı embriogenez, rizogenez, gemmogenez və gemmorizogenez (Şəkil. 1) halları qeydə alınmışdır.

Regenerant bıtkilərtəcrübənin yalnız 2-ci variantında alınmışdır. Tədqiq edilən sortlardan ən yaxşı nəticələr Dəyanətli sortunun huceyrə toxumasında qeydə alınmışdır.

Təcrübənin 1-ci variantında fiksə edılmış vaxtda kallusların uzərındə merıstem ocaqlarının əmələ gəlməsinə baxmayaraq, regenerant bitkilərini almaq mümkün olmadı. Kalluslarda kök və gövdənin əmələ gəlməsinın yalnız başlanğıc mərhələlərı müşahıdə edilırdi ki, orqanların böyümə sürətinın çox zəif olması səbəbindən, onlar inkişafdan qalırdılar və morfogenez prosesi başa çatmamışdı (Şəkil 2).




**Şəkil 1.** Kallus toxumalarında embriogenez (1-1), rizogenez (1 2), qemmogenez (1 3) və qemmorizogenez (1-4)

Ehtimal var ki, istifadə etdiyimiz becərilmə şəraiti, xüsusilə də mühitin fitohormonal tərkibi süd fazasında inokulyasiya edilmş rüşeymlər üçün qeyri-optimal olmuşdur, buna görə də təsvir etdiyimiz variantda biz morfogenezin normal gedişinə nail ola bilmədik. Lakin əldə etdiyimiz ədəbiyyat məlumatlarına görə dənli bitkilərin in vitro kulturasında regenerasiya proseslərinin induksiyasının bilavasitə rüşeymin inkişaf fazası iləsıx bağlı olduğu göstərilmişdir (Кушнаренко, 1990; Дунаева и др., 2000; Ковалева, 2000; Круглова, Касатонова, 2009). Baxmayaraq ki, qida mühitinə 2,4-D-nin əlavə edilməsi əsas şərtlərdən biri sayılır (Hanzel et al., 1985; Powell, Dunwell, 1987; Dahleen, Bregitzer, 2002; Бишимбаева и др., 2013), bu hormon analoqunun eyni qatılıqlarında müxtəlif inkişaf fazasında olan rüşeymlərdən fərqli morfofizioloji reaksiyalaralınmışdır. Nəzarət variantlarında eksplantların həssaslığının 2,4-D-ən asılı olmaması isə müəllifləri belə fikrə gətirib ki, in vitro şəraitində rüşeymlərin hüceyrələrindən morfogen kallusların formalaşması üçün əsasvə vacib şərt inokulyasiya zamanı eksplant hüceyrələrinin sitoloji statusunun, yəni meristemlik qabiliyyətinin olmasıdır (Ковалева, 2000; Круглова, Касатонова, 2009).




**Şəkil 2.** Süd inkişaf fazasında inokulyasiya edilmiş rüşeymlərin kallus toxumalarında meristematik ocaqlar: gövdənin (2-1) və kökün əmələ gəlməsinin başlanğıc mərhələsi (2-2)

Ümumiyyətlə, müəlliflərin əksəriyyəti yetişməmiş rüşeymlərin hüceyrələrini *in vitro* morfogenezdə nəyinki kompetent, həttə bütün morfogen imkanları olan və bu prosesi müxtəlif yollarla həyata keçirən meristematik hüceyrələrin sələfi sayırlar (Дунаева и др., 2000;Круглова Касатонова, 2009). Bəzi müəlliflər bu totipotent bitki hüceyrələrini sütun hüceyrələrin analoqu kimi qiymətləndirirlər (Гапоненко и др., 1985; Круглова, Касатонова, 2009).

Bizim tədqiqatda aldığımız nəticələrin əsasında deyə bilərik ki, tədqiqatda istifadə etdiyimiz arpa bitkilərindən 2016 ildə təcrıd olunmuş və mum fazasında inokulyasiya edilən yetişməmiş rüşeymləri morfogenez cəhətdən becərilmə şəraitinə daha yaxşı kompetentlik göstərmişdilər.

## ƏDƏBİYYAT


**Əsədova S.Ş.** (2015) Arpanın yerli seleksiya sort və sortnümunələrinin *in vitro* kulturaya daxil edilməsi. *AMEA Botanika institutunun elmi əsərləri,* **XXXV:** 173-178

**Əsədova S.Ş.** (2016) Arpanın kallus toxumasının induksiyasına ammonium nitratın təsiri. *AMEA Xəbərləri, biol. və tibb elmləri,* **71(№ 1):** 25-29.

**Акперов З.И., Мамедов А.Т.** (2007) Информационная система по генетическим ресурсам - растений Азербайджана [Електронний ресурс]. *Современные проблемы науки и образования*, **6:** 9-13 (http://www.science-education.ru download/ 2007 06/2007 06 01. pdf).

**Асадова С.Ш.** (2002) Оптимизация питательных сред для микроразмножения люцерны. *AMEA-nın Xəbərləri, biol. elmləri seriyası,* **№1-6:** 365-372.

**Асадова С.Ш.,Гарибов З.А. (**2016) Введение в культуру *in vitro* некоторых сортообразцов ячменя, интродуцированных из Международного центра İCARDA. *Факторы экспериментальной эволюции организмов.* Киев, **19:** 64 67.

**Бишимбаева Н.К., Амирова А.К., Карабаев М.К., Рахимбаев И.Р.** (2013) Преодоление генотипической зависимости регенерации растений *in vitro* у зерновых злаков *Материалы X Международной конференции «Биология клеток растений in vitro и биотехнология».* Казань: с. 101.

**Гапоненко А.К., Мунтян Г.А., Маликова Н.И., Созинов А.А.** (1985) Регенерация растений пшеницы. *Цитология и генетика,* **19(№ 5):** 335-342.

**Данные Государственного комитета по статистике Азербайджанской Республики** (2014) http: /www.stat.gov.az source/agriculture

**Дунаева С.Е., Ковалева О.Н., Голубева Е.А., Москалева Г.И., Козырева О.Г**. 2000. Способность незрелых зародышей к образованию растений-регенерантов в культуре *in vitro* у ранне- и позднеспелых сортов ячменя. 2. Морфологическая дифференциации зародышей как показатель компетентности их клеток к регенерации растений. *Физиология растений*, **47:** 58-64.

**Исаева Г.А., Шумный В.К., Першина Л.А. (**1980) Изучение особенностей каллусогенеза у разных видов ячменя. *Изв. Сибирского отд. АНСССР, сер. биологические науки,* **1(5):** 70-74.

**Картель Н.А Манешина Т.В.** (1977) Каллусообразование у разных по генотипу растений ячменя. *Цитология и генетика*, **11(№6):** 486-490.

**Ковалева О.Н.** (2000) Цитологические аспекты регенерации сортов ячменя. *Автореф. дис. на соискан. учен. степени канд. биол. наук: спец. 03.00.05 «Ботаника».* Санкт-Петербург: 19 с.

**Круглова Н.Н.** (2008) Периодизация развития зародыша пшеницы для биотехнологических исследований. *Аграрная Россия*, **№3:** 20-22.

**Круглова Н.Н., Касатонова А.А.** (2009) *Физиология и биохимия культурных растений*, **41(№2):** 124-131.

**Кушнаренко С.В**. (1990) Морфогенез и регенерация в культуре тканей пшеницы. *Автореф. канд. дисс.* Душанбе: 22 с.

**Лутова Л.А., Бондаренко Л.В., Вузовкина И.С. и др.** (1994) Влияние генотипа растения на регенерационные процессы. *Генетика,* **30(№8):** 106-1074.

**Мамедов З.А., Алиев Э.Б., Талаи Д.М., Мусаев А.Д.** (2010) Роль и перспективы международного сотрудничества в развитии селекции ячменя в Азербайджане. *Сборник научных трудов АзНИИЗ*, **12:** 89-91.

**Чернов В.Е., ПендиненГ.И.** (2011) Сравнительная оценка каллусогенеза и регенерации у различных видов ячменя. *Сельскохозяйственная биология,* **№1:** 44-53.

**Breiman A.** (1985) Plant regeneration from *Hotdeum spontaneum* and *Hordeum bulbosum* immature embryo derived calli. *Plant Cell Rep.*, **2:** 70-73.

**Dahleen L.S., Bregitzer P.** (2002) An improved media system for high regeneration rates from barley immature embryo derived callus cultures of comercial cultivars. *Crop Sci.*, **42:** 934-938.

**Foroughi_W.B., Friedt W., Wenzel G.** (1982) On the genetic improvement of androgenic haploid formation in *Hordeum vulgare* L. *Theor. Appl. Genet.*, **62:** 233-239

**Goldstein C.S., Kronstadt W.E.** (1986) Tissue culture and plant regeneration from immature embryo explants of barley *Hordeum vulgare* L. *Theor. Appl. Genet.,* **71:** 631-636

**Hanzel J.J., Miller L.P., Brinkman M.A. et al.** (1985) Genotypeand media effects on callus formation and regeneration inbarley. *Crop Sci.*, **25(1):** 27 31.

**Mano Y., Rikishi K., Yasuda S.** (1994) Генетические исследованияроста каллуса и регенерация растений из незрелых зародышейячменя. *Bull. Res. Inst. Bioresour. Okayama Univ.*, **2(I):** 43-53.

**Powell W., Dunwell J.M.** (1987) *In vitro* genetics of barley (*Hordeum vulgare* L.): Response of immature embryos to 2,4-dichlorophenoxyacetic acid. *Heredity*, **8:** 75-80.

**Ziauddin A., Simon E., Kasha K.J.** (1990) Improved plant regeneration from shed microspore culture in barley (*Hordeum vulgare* L.) cv. Igri. *Plant Cell Reports*, **90:** 69-72.

**Некоторые Особенности Процессов Каллусо- и Морфогенеза, Индуцированных из Незрелых Зародышей Ячменя**

**С.Ш. Асадова**[1, 2]

[1] *Институт молекулярной биологии и биотехнологий НАН Азербайджана*
[2] *Научно-исследовательский институт земледелия МСХ Азербайджана*

Незрелые зародыши сортов ячменя местной селекции на стадии молочной и восковой зрелости куль тивировались in vitro на питательных средах с одинаковым фитогормональным составом. Изучались особенности процессов каллусо- и морфогенеза, индуцированных из эксплантов разной стадии зрелости.

***Ключевые слова****: Ячмень, in vitro, незрелый зародыш, каллус, морфогенез*

**Some Peculiarities of Calluso-and Morphogenesis Indused from Immature Embryos of Barley**

**S.Sh. Asadova**[1, 2]

[1] *Institute of Molecular Biology and Biotechnologies, Azerbaijan National Academy of Sciences*
[2] *Research Institute of Crop Husbandry, Ministry of Agriculture of the Republic of Azerbaijan*

Immature embryos of barley varieties of domestic breeding were cultured *in vitro* on nutrient media with the same phytohormonal composition at the stages of milk and wax ripeness The peculiarities of the process of callus- and morphogenesis induced from explants at various stages of maturity were investigated.

***Keywords:*** *Barley, in vitro, immature embryos, callus, morphogenesis*

AMEA nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh. 28 35 (2017)

# *Chenopadıaceae* Və *Poaceae* Fəsilələrinin Bəzi Növlərində $C_4$-sikli Fermentlərinin Aktivliyinin Və Kinetik Parametrlərinin Tədqiqi

**T.Y. Orucova*, U.A. Qurbanova, Ü.C. Mustafayeva, Ş.M. Bayramov**

*AMEA Molekulyar Biologiya və Biotexnologiyalar İnstitutu, Mətbuat prospekti 2A, Bakı AZ1073, Azərbaycan;*
**E-mail: orujova.taliya@mail.ru*

**$C_4$-fotosintezin müxtəlif yarımtiplərinə aid olan *Salsola dendroidies, Suaeda a ltissima, Neoa mucranata (Chenopodiaceae)* və *Sorghoum bicolor (Poaceae)* növlərində fosfoenolpiruvat karboksilaza (PEPC), alaninaminotransferaza (AlAT), aspartataminotransferaza (AsAT) fermentlərinin aktivliyi və kinetik parametrləri substratın qatılığından və temperaturdan asılı olaraq öyrənilmişdir. NADP-ME yarımtipinə aid olan *S. bicolor* və *N. mucranata* növlərində $C_4$-siklinin ilkin fermenti olan fosfoenolpiruvat karboksilazanın aktivliyi NAD-ME yarımtipinə aid olan *S. dendroidies* və *S. altissima* növləri ilə müqayisədə daha yüksək olmuşdur. Göstərilmişdir ki, alaninaminotransferaza və aspartataminotransferaza üçün reaksiyanın maksimal sürəti ($V_{max}$) *S. dendroides* və *S. altissima* növlərində daha yüksəkdir. Təd-qiq olunan növlərdə temperaturun 5°C-dən 15°C-yə qədər yüksəlməsi fosfoenolpiruvat karboksilaza fermentinin aktivliyinin 3-4 dəfəyə qədər artmasına səbəb olmuşdur. Müəyyən edilmişdir ki, fosfoenolpiruvat karboksilaza fermentinin maksimal aktivliyi 35-45°C intervalında dəyişir.**

***Açar sözlər:*** *Chenopodiaceae, Poaceae, fosfoenolpiruvat karboksilaza, alanin aminotransferaza, aspartat aminotransferaza*

## GİRİŞ

Ali bitkilərin 19 fəsiləsində fotosintezin $C_4$ yolu müşahidə olunur. $C_4$ fotosintezi həyata keçirən bitki növləri Azərbaycanın quraqlıq və yarımquraq ərazilərində yayılmış *Chenopodiaceae, Euphorbiaceae, Portulaceae, Zygophyllaceae* və *Polygonaceae* fəsilələrinin nümayəndələri arasında rast gəlinir. Həmçinin *Poaceae* (təxminən 4600 növ, ümumi miqdarın 61%), *Cyperaceae* (1330 növ, ümumi miqdarın 18%-i) və *Chenopodiaceae* (təxminən 550 növ, ümumi miqdarın 7%) fəsilələrinin əksər nümayəndələri fotosintezin $C_4$ yolunu həyata keçirirlər (Sage et al. 1999; Pyankov et al 2001). $C_4$ bitkilərin əksəriyyəti üçün karbonun fiksasiyasının karboksilləşmə və dekarboksilləşmə reaksiyalarının həyata keçirilməsində iki huceyrə tipi mezofil hüceyrələr (MH) və örtük topa hüceyrələri (ÖTH) iştirak edirlər (Offermann et al., 2015).

$C_4$-fotosintez dekarboksilləşdirici fermentlərin. NADP-dən asılı malik enzim (NADP-ME), NAD-dan asılı malik enzim (NAD-ME) və fosfoenolpiruvatkarboksikinazanın (PEP-KK) iştirakından asılı olaraq, üç yarımtipə bölünur: NADP-ME, NAD-ME və PEPCK (Fahnenstich et al., 2008; W. Yu et al., 2014). NADP ME yarımtipinə aid olan bitkilər təbiətdə daha geniş yayılmışdır və fotosintetik toxumalar arasında mübadilənin əsas metabolitləri malat və piruvatdır. NAD ME yarımtipinə aid bitkilərdə isə aspartat və alanindir. PEPCK yarımtipinə aid olan bitkilərdə isə mübadilənin əsas metaboliti aspartatdır. PEPCK yarımtipinə aid olan bitkilərə təbiətdə az təsadüf olunur. Son dövrlərdə belə güman edilir ki, $C_4$ növlər arasında qarışıq yarımtiplər də mövcuddur və $C_4$ fotosintezin PEPCK yarımtipi ya NADP-ME və ya NAD-ME yarımtipi ilə birlikdə fəaliyyət göstərir (Furbank, 2011).

Karbonun fiksasiyasının ilkin karboksilləşmə reaksiyası MH-də baş verir və bütün $C_4$ bitkilərdə bu reaksiyanı həyata keçirən fosfoenolpiruvat karboksilaza (PEPC, EC 4.1.1.3) fermentidir (Sage, 2004; Sommer et al., 2012). PEPC ilkin karboksilaza kimi fəaliyyət göstərərək, $CO_2$ qazını fosfoenolpiruvatla (PEP) birləşdirərək dörd karbonlu iki əsaslı oksalo asetat turşusu əmələ gətirir (Sage, 2004; Sommer et al., 2012). Sonra oksaloasetat malata və ya aspartata çevrilir. Karboksilləşmə mərhələsində əmələ gələn üzvi dikarbon turşularının (malat, aspartat) dekar-boksilləşməsi isə ÖTH-da baş verir. ÖTH-a daşınan $C_4$-turşular dekarboksilazaların iştirakı ilə parçalanır, CO2 ayrılır və Kalvin tsiklinə qoşulur. Hər iki karboksilləşmə reaksiyaları bir-biri ilə müsbət korrelyasiya təşkil edir (Furbank, 2011).

Alaninaminotransferaza (AlAT, EC 2.6.1.2) fermenti metabolitik proseslərdə həlledici rol oyna-

yan fermentlərdən biridir. Bu ferment alanin və 2-oksoqlütaratın piruvata və qlütamata çevrilməsini katalız edır. Pirodoksalfosfatdan asılı olan bu ferment bitki metabolizmində, xüsusilə də ilkin karbon metabolızmində və amınturşuların sintezində açar rolunu oynayır (Kendziorek et al., 2012; Duff et al., 2012; McAllister et al., 2013). Həmçinin, alaninaminotransferaza fototənəffüsün və bəzi bitkılərdə peroksisomlarda və mıtoxondridə metabolızmin tənzimlənməsində iştırak edır (Shrawat et al., 2008).

Aspartataminotransferaza (AsAT, EC 2.6.1.1) bıkılərin müxtəlıf hüceyrə kompartmentlərində əks transaminləşmə reaksiyasını həyata keçirərək, qlütamat və oksalasetatdan aspartat və 2- oksoqlütaratın əmələ gəlməsını kataliz edır (McAllıster, 2016). AsAT-ın bir neçə izoforması müxtəlif subhüceyrə orqanoidlərində, sitozolda, xloroplastlarda, mıtoxondrilərdə və peroksısomlarda lokalizasiya olunmuşdur (Duff et al., 2012). AsAT fermentı azotun ilkin assimilyasiyasında, reduksiyaedici ekvivalentlərın nəqlındə və karbon və azotun müxtəlif hüceyrə nəqlındə və karbon və azotun müxtəlif hüceyrə komponentləri arasında paylanmasında mühüm rol oynayır (Torre, 2014; Gaufichon et al., 2015) *Che-nopodiaceae* və *Poaceae* fəsıləsının nümayəndələri arasında strukturuna və metabolizmdə iştırak edən fermentlərın fiziki kımyəvi para metrlərınə görə bir-birındən kəskın fərqlənən $C_4$ növlərə rast gəlmək mümkündür. *Chenopodiaceae* fəsiləsinin $C_4$ növləri arasında iki müxtəlıf dekarboksılləşdırıci yarımtipə rast gəlinır (Voznesenskaya et al. 2013, Rao 2016, Maier et al. 2011). Lakin bəzi $C_4$ növlərin hansı yarımtipə aid olması hələ də mübahisəlidir Bu məqsədlə *S. dendroidies, S. atissima, N. mucranata (Chenopodiaceae)* və *S. bıcolor (Poaceae)* növlərində PEPC, AlAT və AsAT fermentlərinın aktıvlıkləri substratın qatılığından və temperaturdan asılı olaraq müqayisəli şəkildə öyrənilmişdir.

## MATERİAL VƏ METODLAR

Abşeron yarımadasında təbii mühit şəraitındə bitən *S. dendroidıes, S. atissıma, N. mucranata* və suni iqlim şəraitində yetişdirilmiş *S. bicolor* bıtkılərının yarpaqları və dıgər fotosıntetik orqanları tədqiqat materialı kimi istifadə olunmuşdur. Bitkilər inkişafın aktiv fazasında, ıyul avqust aylarında təcrübə üçün toplanmışdır. Maye azotda (77 K) dondurulmş bitki materialı soyuq həvəngdəstədə kvars qumunun iştirakı ılə tərkıbındə 100 mM Tris HCl, 10 мM $MgCl_2$, 1 мM etilendıamintetra-asetat turşusu (EDTA), 5 mM ditiotritol (DTT), 2 mM fenilmetilsulfonil flüorid (PMSF) və 2% (w/v) həll olmayan polivınılpırrolıdon (PVP) olan homogenezasiya buferi əlavə edilməklə ferment pereparatının alınması üçün istifadə edılmişdir. Alınan homogenat süzüldukdən, sonra 5 dəqiqə ərzində 12000g-də sentrifuqalaşdırılmışdır. Alınan supernatant fermentlərinin aktivliklərının təyını üçün ıstıfadə olunmuşdur. Fermentləri aktıvlıyı spektrofotometrık üsulla (Ultrospec 3300 Pro, Amersham, USA) 340 nm dalğa uzunluğunda təyin olunmuşdur. Temperaturdan asılı olaraq fermentlərin aktivliyinin dəyişmə dinamikası hər 5°C-dən bir 5 dəqiqə inkubasiya edilməklə ölçülmüşdür.

Fosfoenolpiruvat karboksılaza fermentinin aktivliyini təyin etmək üçün reaksiya mühiti 1 ml-də tərkibində 50 mM Tris-HCl (pH 8,0) 10 mM $MgCl_2$, 2mM DTT, 10mM $NaHCO_3$, 0,2 mM NADH, 10 U/ml MDH, 10 mM PEP və 40μl ferment ekstraktı olan aktivlik buferindən ibarətdir. Sonda reaksıya mühitınə substrat (10 mM PEP) əlavə etməklə reaksiyanın başlanmasına start verilır (Pyankov 2000).

Alanınaminotransferaza aktivlıyinın təyinı üçun reaksiya muhitının tərkibi aşağıdakı kimı olmuşdur: 100 mM Tris-HCl8,5), 2 mM EDTA, 2,5 mM 2-oksoqlütarat, 10 μg/ml pirodoksalfosfat, 10 mM DTT, 12 U/ml laktat dehidrogenaza və 0,2 mM NADH, 20 μl yarpaq ekstraktı və 10 mM L-alanin ibarətdir. Reaksiya L-alanin əlavə edilməklə başlanır (Alfonso & Brüggemann, 2012).

Aspartataminotarnsferaza aktivliyinin təyini üçün reaksiya mühitinin tərkibi müvafiq olaraq, 100 mM HEPES-KOH (pH 7,4) və 100 mM Trıs-HCl (pH 8,5), 2 mM EDTA, 2,5 mM 2-oksoqlütarat, 10μg/ml pirodoksalfosfat, 10 mM DTT, 12 U ml MDH və 0,2 mM NADH, 20μl yarpaq ekstraktı və 2,5 mM L-aspartatdan ibarətdir. L-aspartatdan əlavə etdikdən sonra reaksiya başlanır (Alfonso & Brüg-gemann, 2012).

*Umumi zülalların miqdarının təyini:* Həllolan zülalın ümumi miqdarı spektrofotometrdə 0,12%-li Coomassie Brılliant Blue G-250 məhlulunun köməyi ilə təyin olunmuşdur. (Sedmak & Grossberg, 1977). Cədvəl və qrafiklərdə verilən qiymətlər orta rıyazı göstəricılər olub orta kvadratık kənara çıxmanı əks etdirirlər. Tədqiqatın nəticələrının analizi zamanı orta riyazi səhvlər və kənarlanmalar (M±m) nəzərə alınmışdır. Ölçmələr bir neçə (üçdən az olmayaraq) bıolojı və analıtik təkrarlarda aparılmışdır. Standart səhvlər və kənarlanmalar Microsoft Office Excel proqramında hesablanmışdır ("Təsvirı statıstıka" opsıyası).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Fosfoenolpiruvat karboksilaza, alaninamino transferaza, aspartataminotarnsferaza fermentlərinin kinetik parametrləri *Chenopodiaceae* fəsiləsinə aid olan bitən *S. dendroidies, S. atissima, N. mucranata* və *Poaceae* fəsiləsinə aid olan *S. bicolor* bitkisində müqayisəli şəkildə tədqiq edilmişdir.

Bu məqsədlə, tədqiq olunan *Chenopadiaceae* və *Poaceae* fəiləsinin nümayəndələrində inkişafın aktiv mərhələlərində PEPC fermentinin aktivliyi onun substrsatı olan PEP-dən (1-30 mM) asılı olaraq öyrənilmişdır (Şəkil 1). Şəkil 1 dən göründü yü kimi, *S. dendroidies*-in yarpaqlarından ayrılmış sitozol fraksıyasında substratın qatılığının dəyişməsindən asılı olaraq PEPC-nın kataliz etdıyı reaksiyanın kinetik sabitləri $K_m$ 4,8±0,1 mM, $V_{max}$–5,8±0,1 µmol·mq$^{1}$ zülal dəq$^{1}$ olmuşdur. *S. altissima* yarpaqlarından ayrılmış sitozol fraksiyasında isə $K_m$ 5,1± 0,1 mM, $V_{max}$ 6,3±0,1 µmol mq$^{1}$ zülal dəq$^{1}$ olmuş-dur. NADP-ME yarımtipinin hər iki nümayəndəsində isə yarpaqlarından ayrılmış sitozol fraksiyasında substratın qatılığının dəyişməsindən asılı olaraq PEPC nın kataliz etdıyı reaksi yanın kinetik sabitlərinın qıyməti bir birinə yaxın olmuşdur. Belə ki, *S bicolor* və *N mucranata yarpaqlarının* sıtozol fraksıyasında PEPC-nın kataliz etdiyi reaksiyanın substratın qatılığının dəyişməsindən asılı olaraq kinetik sabitləri isə müvafiq olaraq $K_m$–4,1 mM və $K_m$–4,0 mM, $V_{max}$– 7,0±0,15 µmol mq$^{1}$ zülal dəq$^{1}$ $V_{max}$–8,5±0,2 µmol mq$^{1}$zülal dəq$^{1}$ olmuşdur.

Şəkil 1-dən göründüyü kimi, tədqiq olunan bütün bitkilərdə 15 mM PEP-in qatılığıda bütün PEPC molekulları ferment-substrat qatılığı əmələ gətirərək fermentin aktiv mərkəzi tam doyma halına keçmışdır. Məhz buna görə də bu vəziyyətdə reaksiyanın sürətinin praktıkı olaraq substratın qatılığından asılı olmadığı aydın görünür. Bu nəticələr Tovar-Méndez və əməkdaşlarının (Tovar-Méndez et al., 1998) apardığı tədqiqat işləri ilə uyğunluq təşkil edir. Belə ki, qarğıdalı (Zea mays) yarpaqlarında əgər substratın allosterik aktivatorlarının qatılıqları aşağı olarsa, substratın fizioloji qatılıqlarından asılı olmayarq fermet inaktivləşir. Bu isə PEPC-nın əsas kinetik xüsusiyyətlərində dəyişikliklərə səbəb olur. Müxtəlif yarımtiplərə aid olan $C_4$ bitkilərdə PEPC-nın substratın qatılığından asılı olaraq və tənzimləyicilərin iştirakı ilə dəyişmə dinamikasının tədqiqi muhüm əhəmiyyət kəsb edir (Tovar-Me´ndez et al., 2000). Bəzi tədqıqatlarda göstərilir ki, allosterik effektorların və PEP-ın sitozolik qatılıqlarında PEPC-ni analiz etməklə *in vivo* şəraitini imitasıya etmək lazımdır (Muramatsu, 2015; Takey et al., 2017).

PEPC-nın metabolitik effektorlarla (Doncaster and Leegood, 1987) və ya post transilyasion modifikasiya ilə tənzimlənməsi substratın doymamış qatılıqlarında müşahidə olunduğundan (Huber and Su-giyama, 1986; Echevarría et al., 1994), substratın yuksək qatılıqlarının ıstifadəsi *in vivo* da PEPC aktıvliyinin və tənzımlənmə mexanızimlərınin düzgün qıymətləndirılməməsınə səbəb ola bilər (Alejandro Tovar-Me´ndez, 2000). PEPC allosterik fermentdir və onun aktivliyi müxtəlif metabolit effektorlarla tənzimlənir (O'Leary et al., 2011a).

*S. dendroıdıes, S. altıssima, N. mucranata* və *S. bicolor* bitkilərinin sitozol fraksiyasından alınmış homogenatda PEPC-nın substratdan asılılığının Mi-xaelis-Menten və Laynuver-Berk əyrisi qurulmuşdur. Laynuver-Berk əyrısindən görunür ki, subsratın yüksək qatılıqlarında müəyyən kənarlanmalar vardır. Bu substrat ingıbırləşməsinin mövcudluğunun əsas göstərıcisıdir. *S. bicolor* və *N. mucranata* bitkılərində ferment PEP-in daha aşağı konsentrasiyasında 15 mM-da, *S. dendroidies və S. altissıma* bitkilərində isə 20-25 mM ferment doyma halına çatır. *S. bıcolor* və *N. mucranata* bitkilərində PEPC-nın aktivliyi *S. dendroidies və S. altissima* bitkiləri ilə muqayısədə daha yüksək olması bitkilərin fizioloji vəziyyəti ilə izah etmək olar.

şüalarının təsirindən yarpaqları saralır və bitkinin dekorativliyi, inkişafı zəifləyir və çiçəkləmə prosesi dayanır. Əgər bitki qış dövründə 14-16°C temperaturda saxlanılarsa il ərzində bir neçə dəfə bol çiçəkləyər. İsti və işıqsevən bitki olan ətli hoya havanın rütubətinin 30 40%, əkildiyi substratın rütubəti isə orta dərəcədə (50-60%) olduqda normal böyüyür və inkişaf edir.



**Şəkil 1.** *Hoya carnosa* R.Br.- çətir çiçək qrupu.

Ətli hoya vegetativ üsulla (qələmlə) çoxaldılmışdır. Bu məqsədlə ana bitkinin 2 və ya 3 illik zoğlarından 2-3 buğumdan ibarət (12-15 sm uzunluqda) olan yaşıl qələmlər kəsilmişdir. Kəsilmiş hər qələmin üzərində bir və ya iki yarpaq saxlanılmaq şərti ilə qalan yarpaqlar kəsilərək təmizlənmişdir. Hazırlanmış qələmlər torf və qum qarışığında (1:2 nısbətdə) ibarət olan substrata basdırılmışdır. Əkin zamanı qələmlərin 2/3 hissəsi substrata basdırılır, yarpaqlı olan bir hissəsi isə çöldə saxlanılmalıdır. Bu cür əkilmiş qələmlər az sulanmaq şərti ilə onlara tez-tez su çilənir.

Ətli hoyadan interyerlərin şaquli yaşıllaşdırılmasında perspektivli sarmaşan dibçək və ampel bitkisi kimi geniş istifadə etmək mümkündür.

**Vuane tetrastiqması (*Tetrastigma voinierianum* (Baltet) Pierre ex Gagnep.)** - *Vitaceae* Juss. fəsiləsinin *Tetrastigma* (Miq.) Planch.cinsinə aid olub, həmişəyaşıl, gövdəsi oduncaqlıdırmaşan liandır (şəkil 2). İri yarpaqlarının uzunluğu 25 sm-ə qədər olub, beşdilimlidir. Yarpağın üst hissəsi hamar, tünd yaşıl, alt hissəsi qırmızımtıl-boz rəngli, tükcüklüdür (Саакoв, 1983).

Çiçəkləri xırda, gümüşü ağ rəngli olub, yarpaq qoltuğunda yerləşən çoxçiçəkli qalxanşəkilli çiçək qrupunda toplanmışdır. Meyvəsi yumru, şirəli, gilə meyvəşəkillidir. Vətəni Avstraliya, Hindıstan, Cənubi və Cənubi-şərqi Asiyanın rütubətli tropik meşələri hesab olunur.



**Şəkil 2.** *Tetrastigma voinierianum* (Baltet) Pierroex Gagnep ümumi görünüşü

Abşeronda örtülü şəraitdə çiçəklədə də, meyvə əmələ gətirməsi müşahidə olunmamışdır. Qidalı torpaqlarda becərildikdə və aqrotexniki qulluq şəraitində (zoğların dayaq üzərinə vaxtında yönəldilməsi, yan zoğların vaxtındabudanması, optimal suvarılma və qida gübrələrinin verilməsi və s.), bir vegetasiya dövründə 10 m-ə qədər uzana bilir. Ona görə də əsasən orajereyalarda, qış bağlarında və geniş işıqlı aynabəndlərdə becərilməsi məsləhətdir. Belə geniş becərilmə şəraitində yan budaqları 3-4 istiqamətdə xüsusi dayaqlar üzərinə istiqamətlən dirməklə, bu bitkidən daxili interyerlərin dekorativ tərtibatında ekzotik element kimi uğurla istifadə etmək mümkündür.

Vuane tetrastiqmasının əsas zoğunun inkişaf dinamikası müxtəlif qida tərkiblı torpaq mühitində öyrənilmişdir (cədvəl 1).

**Cədvəl 1.** *T. voinierianum* növünün Abşeronda örtülü şəraitdə vegetativ zoğunun illik inkişaf dinamikası (2014-2015-ci illər).

| Ölçmələrin aparıldığı tarix | Qidalı torpaqda | | Adi (zəif qidalı) torpaqda | |
|---|---|---|---|---|
| | Artım, sm | Ümumi, sm | Artım, sm | Ümumi, sm |
| 30 01 | 5,0±1,0 | 5,0±1,0 | – | – |
| 28.02 | 7,0±1,0 | 12,0±1,0 | 5,0±1,0 | 5,0±1,0 |
| 30 03 | 10,0±2,0 | 22,0±2,0 | 8,0±1,0 | 13,0±1,0 |
| 30.04 | 18,0±2,0 | 40,0±2,0 | 15,0±2,0 | 28,0±2,0 |
| 30.05 | 225,0±3,0 | 265,0±3,0 | 70,0±3,0 | 98,0±2,0 |
| 30.06 | 275,0±3,0 | 540,0±3,0 | 80,0±2,0 | 178,0±2,0 |
| 30.07 | 200,0±3,0 | 740,0±3,0 | 60,0±2,0 | 238,0±2,0 |
| 30.08 | 150,0±4,0 | 890,0±4,0 | 20,0±1,0 | 258,0±1,0 |
| 30 09 | 70,0±3,0 | 960,0±3,0 | 10,0±1,0 | 268,0±1,0 |
| 30.10 | 15,0±2,0 | 975,0±2,0 | 5,0±1,0 | 273,0±1,0 |
| 30.11 | 5,0±0,1 | 985,0±2,0 | 3,0±1,0 | 276,0±1,0 |
| 30.12 | | 985,0±2,0 | | 276,0±1,0 |

Cədvəl 1-dən göründüyü kimi bu növ qida maddələrinə çox tələbkardır. Belə ki, əsas zoğun illik boy artımı qidalı torpaqlarda 985 sm olduğu halda, adi (zəif qıdalı) torpaqlarda 276 sm olmuşdur.

**Sambak jasmini (*Jasminum sambac* Ait.)** - *Oleaceae* Lindl. fəsiləsinin *Jasmineae* tribinin *Jasminum* L. cinsinə aid olub, həmişəyaşıl, çoxillık sarmaşan bitkidir. O, hər hansı dayağa dolanaraq və ya dırmanaraq 4-6 m-ə qədər uzana bilir. Dayaq tətbiq etmədən, uzanan zoğları mütəmadi kəsərək, bitkiyə dibçəkdə sallanan kol forması da vermək olur. Zoğları zərif-yumşaq tükcüklüdür. Dayağa dolanan zaman tükcüklər köməkverici vasitə rolunu oynayır. Yarpaqlar açıq-yaşıl rəngli, qısasaplaqlı, yumurtavarı, 2,5-10,0 sm uzunluqda olub, səthi demək olar ki, hamar və parlaqdır. Çiçəkləri xırda ağ rəngli, 5-7 ləçəkli, 3-6 ədədi bir yerdə olmaqla çətır-şəkılli formada olub, olduqca ətirlidir (şəkil 3). Yəni, becərildiyi binada onun ətri dərhal hiss olunur. Bir çıçək 20 günə qədər yaşayır. Lakin bu müddətdə yeni çiçəklər formalaşdığından, bitkinin üzəri mart ayından dekabr ayına qədər çiçəklə örtü lü olur. Bıtki təbii halda Asiyanın tropik və subtropık zonalarında yayılmışdır (Головкин, Чеканова, Шахова и др., 1989).



**Şəkil 3.** *Jasminum sambac* Ait.-ın çiçəyi.

Sambaк jasmini əsasən interyerin floristik dizaynında dekorativ və ətirli bitki kımı becərılır. Eyni zamanda çiçəklərinin təmiz halda və qara çayla birlikdə dəmlənməsi ətirli içki kımi çox əhəmiyyətlidir. Bu məqsədlə həm təzə, həm də qurudulmuş çiçəklərdən ıstifadə edılə bilır.

Sarmaşan bıtki olduğundan sambak jasmını üçün mütləq dayaq sistemi qurulmalıdır. Dayaq sistemi istifadə məqsədındən asılı olaraq müxtəlif quruluşda kvadrat, rombşəkilli, ikiqollu və s. ola bılər.

Sambak jasmini işıqsevən bitkidir. Becərildiyi yerdə azacıq kölgəli şərait olduqda zoğun böyümə zonası saralaraq inkişafdan qalır. Bununla belə, yay aylarında, xüsusilə günorta saatlarında birbaşa bitkinin üzərinə düşən günəş şüası da onun inkişafına mənfi təsir edir.

Mülayım-isti (25-30°C) temperatur şəraıtındə daha intensiv inkişaf edib böyüyür. Müşahidələrimiz göstərir ki, becərildıyi şəraitdə temperatur 35°C-dən yuxarı qalxdıqda bitkinin inkişafı zəifləyir. Qış aylarında becərildiyi binanın temperaturu 15-16°C saxlanılmalıdır, əks halda, yəni temperatur yüksək olduqda bitkinin inkışafı dayanır. Belə olan halda, yaz-yay aylarında onun çiçəklənməsi zəifləyir.

Rütubətə tələbkardır. Apardığımız müşahidələr göstərir ki, becərıldıyı mühıtdə havanın nisbi rütubəti yüksək –65-75‰ arasında olduqda bitki intensiv çiçəkləyir. Rutubət aşağı düşdükdə isə çiçəklənmə intensivliyi azalır, əmələ gəlmiş çiçəklər isə tez tokulur. Havanın rütubət rejimini saxlamaq üçün yaz-yay aylarında bitkinin üzərinə tez-tez su çilənməlidir. Eyni zamanda becərıldiyi torpağın da rütubəti normal olmalıdır. Qış aylarında isə suvarmalar azaldılmaqla, bitkilər mülayim temperaturlu otaqlarda saxlanılmalıdır.

**Cədvəl 2.** *Jasmınum sambac* növünün örtülü şəraitdə qələmlərlə çoxaldılması.

| Material | Qələmlərin xüsusiyyətləri | | | | | qələmlərin əkin vaxtı | qələmlərin sayı | oyanma | kallüsün formalaşması | köklərin əmələ gəlməsi | bitmiş qələmlərin sayı | %-lə |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | yaşı | uzunluğu (sm) | diametri (mm) | tumurcuqların sayı (ədəd) | tumurcuqarası məsafə (sm) | | | | | | | |
| Oduncaqlaşmış qələm | 2 | 12-14 | 8-10 | 3-4 | 4-5 | 10.IV | 10 | 05.V | 10.V | 25.V | 6 | 60 |
| | 2 | 12-15 | 8-10 | 3-4 | 4-5 | 20.VIII | 10 | 10.IX | 20.IX | 05.X | 5 | 50 |
| Yaşıl qələm | 1 | 12 15 | 4 5 | 3 4 | 4-5 | 20.VIII | 10 | 05.IX | - | 10.IX | 8 | 80 |

Sambak jasmini qida maddələrinə də tələbkardır. Bitkı torf qarışdırılmış qıdalı torpaqlarda becərilməklə bərabər, yaz və yay mövsümündə ayda iki dəfə olmaqla kompleks gübrələrlə (N, P, K,) və mıkroelementlərlə (dəmır, mis, sink və s.) gübrələnməlıdır. Bitkı bu cür gubrələndiyi halda onun daha yaxşı ınkışaf etdiyi və bol çıçəklədiyi müşahidə olunur.

Sambak jasmını əsasən vegetatıv yolla zoğların əyilərək basdırılması və qələmlə çoxaldılır (cədvəl 2).

Zoğların əyilərək basdırılması üsulu ilə çoxaldılmada yan zoğlardan bir ədədi seçilir və zoğun torpağa basdırılacaq hissəsi yarpaqlardan təmizlənir. Eyni vaxtda qidalı torpaq və qum (1:1 nisbətində) doldurulmuş dibçək ana bitki becərilən dibçəyin yanında yerləşdirilir və yarpaqdan təmizlənmiş zoğ əyılərək həmin dıbçəyə basdırılır. Yenı əkilmış bitki tez-tez suvarılmaqla, 25-30 gündən sonra ana bitkidən ayrılaraq mustəqil bitki kımi becərilir.

Qeyd etmək lazımdır ki, bu cür çoxaldılmada istixananın temperaturu 20 25°C arasında olduqda daha effektli nəticə əldə olunur. Qələmlərlə çoxaldılma zamanı yazda oduncaqlaşmış, yayda isə həm oduncaqlaşmış, həm də yaşıl zoğlardan istifadə olunmuşdur. Qələmlər 3-4 buğumdan ibarət olan 12-15 sm uzunluğunda kəsilərək hazırlanmışdır. Hazırlanmış qələmlər çay qumu qarışdırılmış yarpaq çürüntülü (1:1) substrata əkilir. Qələmlər əkılmiş yeşiyin üzəri şüşə ilə örtülüb temperaturu 18-20°C olan istıxanalarda saxlanılır və mutəmadi su çilə-nərək suvarılır. Bu şəraıtdə qələmlər 40-45 gün müddətində kök əmələ gətırırlər.

2 saylı cədvəldən göründüyü kimi, ən yüksək nəticə avqust ayında yaşıl qələmlərlə çoxaldılma zamanı əldə olunmuşdur. Kök vermış birillik qələmləri daimi yerlərinə köçürmək olar. Daimi yerində sambak jasmininə qulluq, bitki üçün dayaq sisteminin qurulmasından, mütəmadı suvarılmasından, gübrələnməsindən, bitkinin interyerə uyğun formaya salınmasından ıbarətdır.

Öyrənilən bitkilərdə xəstəlik müşahidə olunmamışdır. Lakın, bir sıra zərərverici həşəratlar (qanlı mənənə, unlu yastıca və ağqanad) müşahidə olunmuşdur.

Ziyanvericilərə qarşı mübarızə məqsədilə qoz yarpağının, acı bibər meyvəsinin və dəlibəngin yarpaq və ya meyvəsinin suda qaynadılmış sabunlu məhlulundan istifadə edilmişdir.

Bu məqsədlə qoz və ya dəlibəng bitkisinin 1 kq yarpağı və yaxud acı bibərin 200 q meyvəsi 10 litr suda 30 dəqiqə qaynadılmış və üzərinə 200 q xam sabun əlavə olunur. Hazırlanmış məhlul soyuduqdan sonra süzülmüş və bu məhlulun 1 litri 10 litr suya qarışdırılaraq bıtkıların uzərinə çilənmişdir.

## ƏDƏBİYYAT

**Головкин, Чеканова, Шахова и др.** (1989) Комнатные растения: Справочник. М.: Лесн. пром-сть, 431 с.

**Методика фенологических наблюдений в Ботанических садах СССР** (1979) М.: ГБС АН СССР, вып. 113, с. 3-8.

**Молчанов А.В., Смирнов Б.В.** (1967) Методики изучения прироста древесных растений. М.: Наука, 99 с.

**Сааков С.Г.** (1983) Оранжерейные и комнатные растения и уход за ними. Л.: Наука, 621 с.

**Хромова Т.В.** (1980) Методические указания по размножению интродицированных дре-весных растений черенками. М.: ВАСХНИЛ, 45 с.

## Биоэкологические Особенности Некоторых Декоративных Вьющихся Растений, Выращенных в Закрытых Условиях

**А.Д. Мехралыев, З.Б. Исламова**

*Центральный Ботанический Сад НАНА*

Статья посвящена изучению в закрытых условиях биоэкологических особенностей, динамики роста и развития, агротехники выращивания некоторых декоративных лиан (*Hoya cornosa* (L.f.) R.Br., *Tetrastigma voinierianum* (Baltet) Pierre ex Gagnep, *Jasminum sambac* (L.) Ait ). В результате проводимых исследований были выявлены наиболее перспективные виды лиановых растений для использования в вертикальном озеленении внутренних интерьеров.

***Ключевые слова:*** *Закрытый грунт, лиановые растения, биоэкология, вегетативное размножение, агротехника*

## Growing And Bioecological Features Of Some Ornamental Lian Plants Under Closed Conditions

**A.D. Mehraliyev, Z.B. Islamova**

*Central Botanical Garden, Azerbaijan National Academy of Scıences*

Bioecological features, dynamics of growth and development, agrotechnics of some decorative lianas (*Hoya cornosa* (L.f.) R.Br , *Tetrastigma voinierianum* (Baltet) Pıerre ex Gagnep, *Jasminum sambac* (L.) Aıt.) have been studied under closed conditions. As a result of the research the most promising types of liana plants were ıdentıfied, for use in the vertical gardening of interiors

***Keywords:*** *Closed ground, lians, bıoecology, vegetatıve propagatıon, agrotechnıcs*

AMEA nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh. 74 78 (2017)

# Современное Состояние Буковых Древостоев Большого Кавказа

**А.Б. Яхьяев[1*], Е.П. Сафарова[2], Ф.С. Сейфуллаев[2]**

*[1] Архитектурно-строительный университет, ул. А. Султанова, 11, Баку AZ 1073, Азербайджан;*
*[2] Центральный ботанический сад НАН Азербаджана, Вадамдарское шоссе, 40, Баку AZ 1004, Азербайджан;*E-mail: yahyayev-azasu@bk.ru*

**Для определения состояния буковых древостоев северного региона Республики в трех хозяйствах заложено 16 пробных площадей. Состояние древостоев определено по внешним признакам листьев и ветвей кроны деревьев в различных условиях местопроизрастаний. Результаты проведенных исследований показали, что по степени дефолиации листьев по типам леса и древесным породам, количество поврежденных деревьев было различным. В мертвопокровном типе леса наблюдалось 3-6% поврежденных буковых и 17-21% грабовых деревьев; в овсяницевом – соответственно, 26-32% бука, 31-40% граба и 39-42% дуба. По степени дехромации листьев в рассмотренных насаждениях преобладают здоровые деревья, составляющие соответственно: 87%, 74% и 57% от общего количества. Изучение распределения деревьев по количеству сухих ветвей показало, что в мертвопокровном типе леса основу насаждений составляют деревья 1-го класса повреждения (сухих ветвей в кроне до 10%), в овсяницевом - 2-го класса повреждений (16-40%). По индексу поврежденности деревьев исследуемые насаждения относятся: в мертвопокровном типе леса – к здоровым, в разнотравном- ослабленным; в овсяницевом- сильно ослабленным.**

***Ключевые слова:*** *Древостои, состояние, листья, ветви, крона деревьев, сумма признаков, класс повреждения*

## ВВЕДЕНИЕ

В соответствии стандартам ИСО 8402 (ИСО 9000…, 1991) качество это совокупность свойств и характеристик продукции, которые придают ей способность удовлетворять обусловленные или предполагаемые потребности. Качество основной лесохозяйственной продукции спелых древостоев определяется как совокупность лесосырьевых, средпреобразующих, рекреационных и санитарно-гигиенических свойств. Как правило, высокопродуктивные древостои обладают относительно более высоким уровнем средопреобразующих, т.е. невесомых полезностей леса, но они не выражаются количественными показателями. Защитные и рекреационные свойства используются в процессе лес выращивания, а лесосырьевые – при главном пользовании. Качество древостоев в значительной мере является производным показателем их продуктивности (Алексеев, 1997; Рябоконь, 2001).

Наиболее объективной оценкой качества древостоев является выход 1 $м^3$лесопродукции. Однако на практике, особенно в процессе выращивания, такая оценка сопряжена со значительными техническими трудностями. Поэтому, для определения качества древостоев применяют методы квалиметрии (количественной оценки качества продукции). Для объединения разнокачественных показателей используют ранее разработанные О.И Полубояриновым (Полубояринов, 1976) комплексные показатели, рассчитанные на основании относительных показателей качества древостоев и параметров их весомости. Примеры практического использования комплексных показателей качества приведены в работе (Рябоконь, 1978).

В отдельных случаях встречается применение способа оценки качественного состояния отдельных древостоев или лесных массивов по деревьям I III классов роста и развития по Крафту (если нет сплошного учета) или указываются категории состояния и класс роста и развития. При этом особенное внимание уделяется осмотру верхней трети деревьев (Щевелина и др., 2010).

С учетом выше перечисленных методических указаний в данной работе качество буковых древостоев оценено по категориям состояния деревьев и насаждений в целом (Ковалев, 1999).

*Цель данной работы* - определить качественное состояние буковых древостоев Большого Кавказа в различных лесорастительных условиях.

## МАТЕРИАЛЫ И МЕТОДЫ

Для решения поставленных задач, в буковых насаждениях Кубинского, Кусарского и Шабранского лесхозов выделены 16 пробных

площадей (ПП) каждые по 0,36-0,64 га. Объектами исследования были сложные по форме, смешанные по составу буковые древостои. В этих древостоях распространены: букняки мертвопокровные (*Fagetumnudum*), овсяницевые (*F. festucosum*) и разнотравные (*F. mix. herbacosum*) с типом условия местопроизрастаний (ТУМ) $С_2$, $Д_2$, $Д_3$; букняки II-IV классов бонитета и 0,52-0,68 полноты. Исследования проводились в 2004-2009 гг и повторно для выявления изменений - через 5 лет в 2014 году. В результате были описаны 10-летние лесоводственно-таксационные данные изучаемых объектов. Исследования проводились согласно требованиям ОСТ 56-69-83. Общая характеристика изучаемых объектов представлена в таблице 1.

На этих пробных площадях производили описания каждого дерева с разделением их по шести категориям состояний. Учитывая существующие в лесоводственной практике методические положения и рекомендации (Методически указания…, 1987; Робакидзе и Торлопова, 2010; Рожков и Козак, 1989; Санитарные правила…, 1992; Шяпятене и др., 2010) по определению категории состояния деревьев и древостоев в целом, в работе была применена несколько измененная нами под буковым насаждениям шестибальная шкала (Яхяев, 2013):

I внешне здоровое дерево без признаков ослабления, с густой темно-зеленой кроной; сухих веток в кроне не более 15%, поврежденные листья не более 10%;

II – ослабленное дерево с несколько изреженной кроной, иногда светло-зеленого цвета; сухих веток в кроне от 16 до 40%; поврежденные листья от 11 до 25%;

III сильно ослабленное дерево с редкой кроной, иногда желтоватой окраской листвы; сухих веток от 41 до 70%; поврежденные и опавшие листья от 26 до 60%;

IV - усыхающее дерево с очень редкой желтеющей кроной, иногда состоящей из одной двух скелетных ветвей; сухих веток более 70%; поврежденные и опавшие листья от 61 до 90% ,

V - свежий сухостой, дерево усохло в текущем году или в конце прошлого сезона, иногда сохранившимися сухими желто-бурыми или бурыми листьями, кора не отслаивается, сухих веток до 100%; поврежденные и опавшие листья до 100%.

VI - старый сухостой, дерево усохло более года назад

Жизненное состояние древостоев оценивали с помощью индекса средневзвешенного класса повреждения составляющих древостой деревьев (Алексеев, 1989, Репшае и Палишике, 1983, Робакидзе и Торлопова, 2010):

$$I = \sum_{i=1}^{6} i \cdot w_i / W ,$$

где I – индекс жизненного состояния древостоя, балл; $i$ – индекс поврежденности деревьев, балл; $w$ – статический вес деревьев $i$-го класса повреждения; $W$ – сумма статистических весов.

По величине индекса состояние древостоя классифицировали на здоровые (индекс 0-0,5), ослабленные (0,6-1,5), сильно ослабленные (1,6-2,5), усыхающие (2,6-3,5), свежий сухостой (3,6-5,5) и старый сухостой (5,6 и более).

**Таблица 1.** Характеристика объектов исследования

| № ПП | Состав древостоя | Тип леса/ ТУМ | Возраст, лет | Средние | | Число дерев-в, шт./га | Общий запас, м³/га | Класс бонитета | Сумма площадей сечений, м²/га |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | H, м | D, см | | | | |
| **Кусарское лесничество Кусарского лесхоза** | | | | | | | | | |
| 1 | 8Бк2Гр+Кл | мрп Д₂ | 65 285 | 23 | 40 | 237 | 230 | III | 29,77 |
| 2 | 8Бк2Гр | ртр/Д₃ | 60-260 | 23 | 40 | 208 | 225 | III | 26,12 |
| 3 | 7Бк3Гр+Кл | ртр Д₃ | 55-184 | 20 | 28 | 437 | 202 | III | 26,89 |
| 4 | 8Бк2Гр+Яс | мрп Д₂ | 50-212 | 22 | 32 | 273 | 181 | III | 21,94 |
| **Рустовское лесничество Кубинского лесхоза** | | | | | | | | | |
| 5 | 9Бк1Гр | овс/С₂ | 65-250 | 22 | 40 | 193 | 200 | II | 24,24 |
| 6 | 8Бк2Гр | овс/С₂ | 56 188 | 19 | 36 | 226 | 164 | II | 22,99 |
| 7 | 6Бк4Гр | овс С₂ | 52-166 | 17 | 32 | 276 | 142 | III | 22,19 |
| 8 | 6Бк4Гр | ртр Д₂ | 76 272 | 22 | 44 | 109 | 136 | II | 16,57 |
| 9 | 7Бк3Гр | ртр Д₂ | 62-258 | 21 | 40 | 155 | 153 | II | 19,47 |
| 10 | 8Бк2Гр | мрп Д₂ | 75-286 | 26 | 44 | 115 | 170 | I | 17,48 |
| 11 | 8Бк2Гр | мрп Д₂ | 86 310 | 27 | 52 | 124 | 266 | I | 26,32 |
| **Дивичинское лесничество Шабранского лесхоза** | | | | | | | | | |
| 12 | 5Д3Гр2Бк | овс С₂ | 35-128 | 11 | 20 | 675 | 85 | IV | 21,19 |
| 13 | 4Д3Бк3Гр | овс/С₂ | 45 140 | 13 | 24 | 478 | 92 | IV | 21,61 |
| 14 | 4Бк3Д3Гр | овс/С₂ | 52-156 | 18 | 24 | 354 | 108 | III | 16,01 |
| 15 | 6Бк2Д 2Гр | ртр/Д₂ | 77-174 | 17 | 28 | 315 | 124 | III | 19,39 |
| 16 | 5Бк3Гр2Д | ртр Д₂ | 62 186 | 19 | 36 | 198 | 144 | III | 20,14 |




**Рис. 1.** Средневзвешенный класс дефолиации крон (а) и дехромации листьев (б) деревьев.

Внешний вид дерева определяется совокупностью признаков, каждый из которых может быть достаточен для оценки поврежденности, однако наиболее информативны показатели состояния ассимиляционного аппарата. С помощью бинокля марки БПЦ с расстояния, равного высоте дерева, у всех живых деревьев на ПП в баллах (от 0 до 3) оценивали степень дехромации (изменение цвета) листьев и дефолиации (потеря листьев) кроны (Робакидзе и Торлопова, 2010). По степени дехромации и дефолиации листья деревья распределяли на пять классов, используя следующую шкалу:

1) <10% ; 2) 11-25%; 3) 26-60%; 4) 61-90%; 5) до 100%. Кроме этого, учитывали количество сухих веток в кроне дерева по шкале: 1)<10%; 2) 11 25%; 3) 26 50%; 4) 51 99%. Состояния вершины дерева оценивали по шкале: 1) живая; 2) поврежденная; 3) усыхающая; 4) сухая (Kenneweg, 1985).

## РЕЗУЛЬТАТЫ И ОБСУЖДЕНИЕ

Оценка устойчивости буковых древостоев по степени дефолиации листьев достаточно объективна и характеризует состояние древостоя в текущем вегетационном периоде (Алексеев-97). Анализом этих показателей на пробных площадях (ПП1, ПП4, ПП10-11, ПП5-7, ПП12-14) выявлено, что древостои состоящие в основном из бука (*Fagus* L.), граба (*Carpinus* L.) и дуба (*Quercus* L.) относятся к 1-му классу повреждения листьев кроны в пределах соответственно: 76 96%; 60 87% и 55 61% (рис.1, а). Здоровых буковых деревьев по данному показателю в среднем на 17% больше граба и на 28% - дуба. Количество деревьев бука 2-го класса повреждения в 1,6 раза меньше граба, в 2,8 раза – дуба. В 3-ем классе количество поврежденных буковых деревьев уменьшалось до 4%, тогда как грабовых составило 9%, дубов 14%.

В рассмотренных насаждениях по типам леса и древесным породам количество поврежденных деревьев изменились в пределах: в мертвопокровном типе бук 3-6%, граб 17-21%; в овсяницевом бук 26-32%, граб 31-40%, дуб 39-42%. Как видно, в свежих условиях местопроизрастаний по данному показателю здоровых буковых деревьев на 14% больше, чем граб, а в суховатых условиях - на 7 и 12% соответственно, чем граба и дуба. Деревья с потерей листьев от 61 до 100% были единичны только в овсяницевом типе с суховатыми условиями местопроизрастаний.

Обследование жизненного состояния бука, граба и дуба по степени дехромации листьев показало, что на пробных площадях (ПП2-3, ПП8 9, ПП15 16) преобладают здоровые деревья, составляющие соответственно 87%, 74% и 57% от общего количества (рис. 1, б). Сравнительно немного деревьев имеют 11-25% пожелтевшей листвы (2-го класса повреждения), в том числе: бука 4%, граба -10% и дуба -17%. В 3-ем классе повреждения (26-60% пожелтевшие листья) встречались единичные экземпляры буковых деревьев.В 4-ом классе повреждения по данному показателю деревья этой породы отсутствуют. Полученные данные еще раз подтверждает высокую антропогенную нагрузку буковых насаждений региона в виде неурегулированной рубки и пастьбы скота (Яхяев и Юсифова, 2005).

Изучение распределения деревьев по количеству сухих ветвей показало, что в мертвопокровном типе леса распространенный в ПП1, ПП4, ПП10 11, основу насаждений составляют деревья 1-го класса повреждения (сухих ветвей в кроне 10%) со средними показателями 92% бука и 79% граба (рис. 2).

В овсяницевом типе леса по количеству сухих ветвей основная часть деревьев относятся к 2-му классу повреждения (16-40% сухих ветвей). По породам деревья этого типа распреде-

лены следующем образом: бук  84%, граб - 72%, дуб - 54%. В 1-ом классе количество поврежденных деревьев было немного: бук -3%, граб  6%, дуб  10%, а в 3-ем классе поврежденные деревья уменьшались соответственно до 4, 7 и 10%. Деревья, имеющие более 70% сухих ветвей в данном типе леса были единичны (до 2% граба и до 4% дуба).




**Рис. 2.** Распределение деревьев по классам повреждения в зависимости от количества сухих ветвей в кроне

Как видно, по количеству сухих ветвей деревья буковых насаждений, распространенные в суховатых условиях, являются менее устойчивыми к антропогенно-климатическим воздействиям.

Во время проведенных исследований обнаружено, что значительная часть буковых деревьев пробных площадей относятся к 1-му классу повреждения. По количеству сухих ветвей в кроне более чувствительной являются деревья дуба. Анализом распределения деревьев по классам повреждения выявили, что древостои пробных площадей состоят в основном из здоровых деревьев бука, граба и дуба. При этом здоровых деревьев бука в среднем на 14% больше, чем граба. В районе исследований были обнаружены только единичные деревья граба и дуба, находящиеся в стадиях отмирающих и отмерших деревьев.

В результате проведенных работ для различных условий местопроизрастаний установили состояния буковых древостоев по сумме всех признаков повреждений деревьев: в мертвопокровном типе леса 15,8-19,0%, разнотравном - 27,2-48,7%, овсяницевом - 54,6-73,1%.

По индексу поврежденности деревьев исследуемые насаждения характеризуются как: в мертвопокровном типе леса ($i$=0,32-0,38) - здоровые; в разнотравном- ($i$ 0,55-1,46) - ослабленные; овсяницевом ($i$=1,64 2,92) сильно ослабленные.

## ВЫВОДЫ

По результатам исследований можно отметить следующее:

1. Состояние буковых древостоев оценено в трех хозяйствах региона по состоянию листьев и количеству сухих ветвей кроны.
2. Общее состояние кроны деревьев и древостоев в целом определено по сумме признаков повреждений, отражающие в шести классах повреждения.
3. По интегральным классам повреждения состояние буковых древостоев оценено следующим образом: в мертвопокровном типе леса с индексом поврежденности 0,32-0,38 как здоровые, в разнотравном(0,55-1,46) – как ослабленные, в овсяницевом (1,64- 2,92).м – как сильно ослабленные насаждения.

## ЛИТЕРАТУРА

**Алексеев В.А.** (1989) Диагностика жизненного состояния деревьев и древостоев. *Лесоведение,* **4:** 51-57.

**Алексеев А.С.** (1997) Мониторинг лесных экосистем. СПб.: ЛТА, 116 с.

**ИСО 9000-ИСО 9004, ИСО 8402** (1991) Управление качеством продукции. М.: Изд-во стандартов. 39 с.

**Ковалев Б.И.** (1999) Оценка степени изменения состояния лесов. *Лесное хозяйство,* **2:** 45-46.

**Методические указания по оценке жизненного состояния сосны, ели и березы** (1987) Каунас: 32 с.

**Полубояринов О.И.** (1976) Оценка качества древесины насаждений на основе комплексного показателя. *Лесная, деревообраб. и цел.-бум. пром-сть,* **4:** 39-41.

**Репшас Э.А., Палишкис Е.Е.** (1983) Дигрессия и экологическая емкость лесов рекреационного назначения. *Лесоведение,* **1:** 3-10.

**Робакидзе Е.А., Торлопова Н.В.** (2010) Состояние древесных растений еловых фитоценозов в зоне аэротехногенного действия целлюлозно-бумажного производства. *Лесной журнал,* **2:** 47-56.

**Рожков А.А., Козак В.Т.** (1989) Устойчивость лесов. М.: Агропромиздать, с. 39-71.

**Рябоконь А.П.** (1978) О качестве стволов в древостоях различной густоты. *Лесное хозяйство,* **5:** 33-36.

**Рябоконь А.П.** (2001) Исследование качества древостоев. *Лесной журнал,* **1:** 36-45.

**Санитарные правила в лесах Российской Федерации** (1992) М.: Экология, 17 с.

**Шяпятене Я. И др.** (1989) Оценка жизнеспособности сосны, ели и березы в условиях Литвы. *Лесное хозяйство*, **9:** 33-35.

**Шевелина И.В. и др.** (2010) Таксационные осо бенности сосновых древостоев различных стадий рекреационной дигрессии. *Лесной журнал*, **5:** 30-36.

**Яхьяев А.Б., Юсифова К.Р.** (2005) Экологическая эффективность лесов Азербайджана. *Тезисы.докл. межд. конф.* Баку: Минэкология, с. 142-143.

**Яхьяев А.Б.** (2013) Оценка состоянии буковых древостоев северо-восточного склона Большого Кавказа. *Тезисы.докл. межд. науч. конф. "Current Challenges of Sustainable Forest Management in Caucasus"*. Тбилиси: с. 54.

**Kenneweg H.** (1985) Monitoring forest damage. In fluences of forest damage on forestry andtimbertrade. Berichte des Forschungszentr. Waldokosysteme (Waldserben) Conference. LIGNA: Hannover, p. 38-63.

### Böyük Qafqzınfıstıq Ağaclıqlarının Müasir Vəziyyəti

**A.B. Yəhyayev[1], E.P. Səfərova[2], F.S. Seyfullayev[2]**

[1]*Memarlıq və İnşaat Universıteti*
[2]*AMEA Mərkəzi Nəbatət Bağı*

Respublıkanın şimal reqionundakı fistıq ağaclıqlarının vəzıyyətlərini muəyyən etmək uçün uç təsərrüfatda 16 təcrübə sahəsi qoyulmuşdur. Ağaclıqların vəziyyəti müxtəlif meşəbitmə şəraıtlərındə ağacların çətırlərındəkı yarpaqların və budaqların xarıcı əlamətlərınə görə təyın edilmışdır. Aparılan təcrubələrın nətıcəsi olaraq müəyyən edılmişdir ki, yarpaqların defoliasıya dərəcəsinəgörə zədələnmiş ağacların sayı meşə tiplərınə və ağac cinslərinə görə aşagıdakı kimi dəyişilir: ölü örtüklü meşə tipində fıstıq -3-6%, vələs – 17-21%; taxılotu örtüklu meşə tıpındə fistıq 26-32%, vələs 31-40%, palıd 39-42% Yarpaqların dexromasıya dərəcəsınə görə tədqiq edilən ağaclıqlarda sağlam ağaclar (fistıq – 87%, vələs – 74%, palıd – 57%) üstünlük təşkil edir. Ağaclıqların vəzıyyətının, quru budaqların sayına görə tədqıqı gostərdı ki, ölu örtuklü meşə tıpındə ağaclıqların əsasını 1-ci zədələnmə sinifinə ( quru budaqları 10%-ə qədər), taxılotu örtüklü meşə tipində isə - 2-ci zədələnmə sınifinə (16-40%) aıd ağaclar təşkil edır. Ağacların zədələnmə ındeksinə gorə tədqiq edılən ağaclıqlarım sağlamlıq vəzıyyətı aşağıdakı kimi qiymətləndirilir: ölü örtüklü meşə tıpındə - sağlam, müxtəlfotlu tıpdə - zəıf, taxılotu örtuklü tipdə - çox zəif.

***Açar sözlər**: Ağaclıqlar, vəziyyət, yarpaqlar, budaqlar, ağacların çətırı, əlamətlərin cəmi, zədələnmə sinifləri*

### Modern State Of Beech Stands Of Great Caucasus

**A.B. Yakhyayev[1], E.P. Safarova[2], F.S. Seyfullayev[2]**

[1]*Archıtectural and Constructional University, Azerbaijan*
[2]*Central Botanical Garden, Azerbaijan National Academy of Sciences*

For evaluatıng the state of beech stands in the northern region of the Republic, 16 plots ın 3 farms were established. The state of stands is determined by the external characteristics of the leaves and branches of the crown of trees under dıfferent growıng condıtions. As a result of the conducted studıes ıt was revealed that the number of damaged trees were different according to the degree of defoliation of leaves within forest types and wood species: in the dead cover type- beech -3-6% hornbeam - 17-21%; in fescue - beech 26-32%, hornbeam - 31-40%, oak - 39-42%. In the examined stands accordıng to the degree of leaf dechromatıon healthy trees prevail, which makes up 87%, 74% and 57% of the total, respectively. The study of the distributıon of trees by the number of dry branches showed that ın the dead cover type of forest, basis of the plantations belongs to the trees of the 1st class of damage (dry branches in the crown of 10%), ın the fescue 2nd class of damage (16-40%) Accordıng to the index of tree damage, the studied plantatıons are healthy in the dead cover type of the forest, weakened in the mixed grass, and greatly weakened in the fescue grass.

***Keywords:** Stands, state, leaves, branches, tree crowns, the sum of signs, class of damage*

AMEA nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh. 79 82 (2017)

# Cənubi Xəzərin Kiçik Qızılağac Körfəzində Sıfın – *Sander Lucioperca* (Linne, 1758) Bioekoloji Xüsusiyyətləri

**E.H. Tahirov*, M.M. Axundov**

*Azərbaycan Elmi-Tədqiqat Balıqçılıq Təsərrüfatı İnstitutu, Ə. Dəmirçizadə küç.,36, Bakı AZ1008, Azərbaycan; *E-mail:* azfiri@azeurotel.com

**2009-15-ci illərdə Cənubi Xəzərin Kiçik Qızılağac körfəzində ixtioloji tədqiqatlar aparılarkən 119 ədəd sıf ovlanmış, onların bio-ekoloji xüsusiyyətləri (bədənin uzunluğu, kütləsi və dolğunluğu, yaş tərkibi, məhsuldarlığı s.) müəyyən edilmişdir. Kiçik Qızılağacda yaşayan digər balıqların populyasiyalarının say dinamikasına yırtıcı balıqlardan olan çay sıfının əhəmiyyətli təsir etməsi ilə əlaqədar onun ehtiyatlarının tənzimlənməsi vacib hesab olunur. Bu məqsədlə körfəzdə spinninqlə həvəskar balıq ovunun inkişaf etdirilməsi təklif olunur.**

***Açar sözlər:*** *Sıf, yaş tərkibi, bio-ekoloji xüsusiyyətlər, dolğunluq, yırtıcı balıqlar, məhsuldarlıq, Kiçik Qızılağac*

## GİRİŞ

Cənubi Xəzərin qərb hissəsində Lənkəran şəhərindən şimalda yerləşən Kiçik Qızılağac körfəzinin uzunluğu 16,7 km, eni 6,5 km, səthinin sahəsi 150 km$^2$, ən çox dərinliyi isə 2,5 m-dən bir qədər çoxdur. Viləşçay, Boladiçay və Qumbaşı çaylarının suları axıb buraya tökülür Bu su tutarı bəndlə açıq dənizdən təcrid edilmiş və onunla əlaqəsi kanallar vasitəsi ilədir Körfəzin suyu şirindir, lakin onun bəzi hissələrində suyun minerallaşması 2,4‰-ə qədər qalxa bilir. Ali bitkilərdən burada qamış üstünlük təşkil edir.

Müxtəlif ədəbiyyat mənbələrində (Абдурахманов, 1962; Мамедов, Аббасов, 1984; Мамедов, 1989; Кулиев, 1989, 2002; Сулейманов, 1989; Исмаилов, 1994; Ибрагимов, 2012) olan məlumata görə Kiçik Qızılağac körfəzinin ixtiofaunası 41 növ və yarımnöv balıqdan təşkil olunmuşdur. Bunların arasında yırtıcı həyat tərzi keçirən sıf *Sander lucioperca* (Linne, 1758) da vardır. Buranın yarımkeçici balıqlardan oln sıf həyatının çox hissəsini Xəzər dənizinin sahilyanı sularında keçirib çoxalmaq üçün şirin sulara, o cümlədən Kiçik Qızılağac körfəzinə daxil olur. Qiymətli əmtəə keyfiyyətlərinə malik olduğundan körfəzin mühüm vətəgə obyektlərindəndir. Onun bio-ekoloji xüsusiyyətlərinə ədəbiyyatda müəyyən məlumatlar olsa da, onlar keçən əsrin 80-ci illərinə qədər olan dövrdə toplanmış materiallar əsasında yazılmış və indiki zaman üçün xeyli köhnəlmişdir. Bununla əlaqədar olaraq Kiçik Qızılağac körfəzində sıfın bio-ekoloji xüsusiyyətlərinə dair yeni məlumatların toplanmasına böyük ehtiyac var idi.

## MATERİAL VƏ METODLAR

2009-15-ci illərdə Kiçik Qızılağac körfəzində yaşayan balıqlara dair material toplanarkən, başqa balıqlarla birlikdə 119 ədəd (97 ədəd yetkin, 22 ədəd körpə) də sıf ovlanaraq tədqiq olunmuşdur. Ov zamanı gözlərinin ölçüsü 32 x 32, 40x40 mm olan qurma torlardan və gözlərinin ölçüsü 12 x 12 mm, 28 x 28 mm olan sürutmə torlardan istifadə edilmişdir. Tədqiqat ümumi qəbul olunmuş ixtioloji metodlar (Чугунова, 1958; Правдин, 1966; Анохина, 1969) əsasında həyata keçirilmiş, balıqların bioloji göstəriciləri (uzunluğu, kütləsi, dolğunluğu, yaşı, cinsiyyəti və s.) müəyyən olunmuşdur. Alınmış nəticələrin etibarlılığı variasiya statistikası metodu (Плохинский, 1978) ilə hesablanmış, bu zaman orta arifmetik rəqəm (*M*) və onun səhvi (*m*) hesablanmışdır. Aparılmış tədqiqatın nəticələri göstərilərkən aşağıdakı şərti işarələrdən istifadə olunmuşdur: *TL* ümumi bədən uzunluğu, *SL* bədən uzunluğu, *P* kütlə, $P_1$ içalarsız kütlə, *F* Fultona görə dolğunluq əmsalı, *K* Klarka görə dolğunluq əmsalı.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Tədqiqat işi apardığımız dovrdə Kiçik Qızıl ağac körfəzindən ovladığımız 97 ədəd yetkin sıfdan 54 ədədi erkək, 43 ədədi isə dişi fərdlərdən ibarət olmuşdur. Tədqiq olunmuş balıqların ümumi bədən uzunluğu 27,9-51,2 sm arasında dəyişilərək, orta hesabla 34,2±0,28 sm; bədənin standart uzunluğu 25,4-46,3 sm arasında dəyişilərək, orta hesabla 31,2±0,64 sm; bədənin ümumi kütləsi 278-1832 q arasında dəyişilərək, orta hesabla 464,0±51,2 q; bədənin içalatsız kütləsi 246-1583 q arasında dəyişilərək, orta hesabla 382±38,1 q; Fultona görə dolğunluq əmsalı 1,13-2,68 arasında dəyişilərək, orta hesabla 1,51±0,04; Klarka görə dolğunluq əmsalı isə 0,98-2,43 arasında dəyişilərək, orta hesabla 1,38±0,05 təşkil etmişdir (Cədvəl 1).

**Cədvəl 1.** Kiçik Qızılağac körfəzində sıfın bioloji göstəriciləri

| Göstəricilər / Əlamətlər | Erkək fərdlər (n=54)<br>lim<br>*M±m* | Dişi fərdlər (n=43)<br>lim<br>*M±m* | Hər iki cins (n=97)<br>lim<br>*M±m* | *P* |
|---|---|---|---|---|
| ***TL*** **(sm)** | 27,9 47,3<br>33,4±0,37 | 29,3 51,2<br>35,8±0,42 | 27,9 51,2<br>34,2±0,28 | <0,05 |
| ***SL*** **(sm)** | 25,4-42,6<br>30,2±0,42 | 26,7-46,3<br>32,9±0,33 | 25,4-46,3<br>31,2±0,64 | <0,05 |
| ***P*** **(q)** | 278-1697<br>441±38,9 | 307-1832<br>498±42,4 | 278-1832<br>464±51,2 | <0,05 |
| $P_1$ **(q)** | 246-1473<br>369±43,9 | 276 1583<br>407±39,6 | 246 1583<br>382±38,1 | <0,05 |
| ***F*** | 1,13-2,42<br>1,49±0,05 | 1,18-2,68<br>1,55±0,03 | 1,13-2,68<br>1,51±0,04 | <0,01 |
| ***K*** | 1,02 2,43<br>1,39±0,06 | 0,98 2,39<br>1,37±0,03 | 0,98 2,43<br>1,38±0,05 | <0,05 |

Tədqiq olunmuş balıqların erkək və dişı fərdlərinin uzunluq və kütlə göstəriciləri arasında kəskin fərq qeydə alınmamışdır. Fultona görə dolğunluq əmsalının qiyməti dişi fərdlərdə erkək fərdlərə nisbətən bir qədər (orta hesabla 0,06) yüksək olmuşdur. Ümumiyyətlə tədqiqat apardığımız müddətdə məlum olmuşdur ki, sıfın Fultona görə dolğunluq əmsalı əsasən qış fəslində yüksək olur. Bunun əsas səbəbi cinsi vəzilərin bu dövrdə yetişməsidir. Kürütökmədən sonra dolğunluq əmsalı xeyli aşağı düşür (Cədvəl 1).

Tədqiq etdiyimiz ən xırda balığın yaşı 2 il, ən iri balığın yaşı isə 5 il olmuşdur. Ovda 2-3 yaşlı balıqlar üstunlük təşkil etmişdir. Yaşa gorə balıqların bioloji göstəriciləri aşağıdakı kimi dəyişmişdir: bədənin ümumi uzunluğu 2 yaşlılarda 27,9 sm-lə 31,2 sm arasında dəyişərək, orta hesabla 28,9±0,46 sm; 3 yaşlılarda 29,8 sm-lə 41,3 sm arasında dəyişərək, orta hesabla 33,7±0,51 sm; 4 yaşlılarda 39,8 sm-lə 44,3 sm arasında dəyişərək, orta hesabla 41,3±0,57 sm; 5 yaşlılarda 42,4 sm-lə 51,2 sm arasında dəyişərək, orta hesabla 46,8±0,72 sm; bədənin standart uzunluğu 2 yaşlılarda 25,4 sm-lə 27,8 sm arasında dəyişərək, orta hesabla 26,1±0,57 sm; 3 yaşlılarda 26,4 sm-lə 36,6 sm arasında dəyışərək, orta hesabla 30,4±0,72 sm; 4 yaşlılarda 35,7 sm-lə 39,7 sm arasında dəyişərək, orta hesabla 36,8±0,83 sm; 5 yaşlılarda 38,8 sm-lə 46,3 sm arasında dəyişərək, orta hesabla 42,9±0,86 sm; bədənin tam kütləsi 2 yaşlılarda 278 q-la 387 q arasında dəyişərək, orta hesabla 314,7±46,2 q; 3 yaşlılarda 397 q-la 562 q arasında dəyişərək, orta hesabla 452,7±60,3 q; 4 yaşlılarda 527 q-la 997 q arasında dəyişərək, orta hesabla 681,7±64,3 q; 5 yaşlılarda 943 q-la 1832 q arasında dəyişərək, orta hesabla 1157,3±98,4 q; bədənin içalatsız kütləsi 2 yaşlılarda 246 q-la 339 q arasında dəyişərək, orta hesabla 274,6±27,3 q; 3 yaşlılarda 347 q-la 497 q arasında dəyişərək, orta hesabla 379,4±32,9 q; 4 yaşlılarda 463 q-la 843 q arasında dəyişərək, orta hesabla 589,6±52,7 q; 5 yaşlılarda 824 q-la 1583 q arasında dəyışərək, orta hesabla 996,4±86,7 q; Fultona görə dolğunluq əmsalı 2 yaşlılarda 1,13-2,54 arasında dəyişərək, orta hesabla 1,49±0,06; 3 yaşlılarda 1,16-2,49 arasında dəyişərək, orta hesabla 1,50±0,04; 4 yaşlılarda 1,19-2,65 arasında dəyişərək, orta hesabla 1,52±0,05; 5 yaşlılarda 1,21-2,68 arasında dəyişərək, orta hesabla 1,53±0,07; Klarka görə dolğunluq əmsalı 2 yaşlılarda 0,99-2,32 arasında dəyişərək, orta hesabla 1,37±0,04; 3 yaşlılarda 1,01-2,31 arasında dəyışərək, orta hesabla 1,39±0,07; 4 yaşlılarda 1,03-2,43 arasında dəyişərək, orta hesabla 1,40±0,06; 5 yaşlılarda 0,98-2,42 arasında dəyışərək, orta hesabla 1,36±0,05.

Yaş artdıqca sıfın Fultona gorə dolğunluq əmsalı artır. Belə ki, 4-5 yaşlı balıqlarda dolğunluq əmsalı ən yüksək, 2 yaşlı balıqlarda isə ən aşağı göstəriciyə malık olur. Bunun əsas səbəbi sıfın aşağı yaş qruplarında boy artımının, yuxarı yaş qruplarında isə kütlə artımının daha sürətlə getməsidir.

Kiçik Qızılağac körfəzində sıfın bioloji göstəricilərinin (uzunluq, kutlə, dılğunluq və s.) əvvəlki illərlə müqayisədə azalmasına və yaş tərkibinin dəyişılməsinə təsir edən amillərdən biri ekoloji şəraitin pisləşməsi və balıq ovu zamanı istifadə olunan ov alətlərinin ümumi qəbul edilmış standartlara uyğun olmamasıdır.

Ümumiyyətlə istər Kiçik Qızılağac körfəzində, istərsə də respublikamızın digər su hövzələrində son illərdə sıfn ovu nisbətən aşağı yaş qrupları hesabına aparılır ki, bu da cinsi yetkinliyə çatmayan balıqların ovlanmasına və bu qiymətli balığın ehtiyatının azalmasına səbəb olur.

Tədqiqat apardığımız müddətdə o da məlum olmuşdur ki, əksər balıqlarda olduğu kimi çoxalmaya yaxın vaxtlarda sıfların da erkək fərdləri (67-72%) çoxalma yerinə dişilərə nisbətən daha tez gəlirlər. Lakın kürutökmə dövrundə erkək və dişı fərdlərin nisbəti təxminən 1:1 kimi olur.

Ovlanmış kiçik (2-3) yaşlı balıqlar arasında erkək fərdlərin sayı dişi fərdlərə nisbətən çox olduğu halda (erkəklər 29 ədəd, dişılər 20 ədəd), boyük

(4-5) yaşlı balıqlarda erkəklərin və dişilərin sayı yaxınlaşmağa başlayır (uyğun olaraq 25 və 23 ədəd olur).

Bızım 2009-15-cı ıllərdə Kıçik Qızılağac körfəzində apardığımız tədqıqatlar zamanı məlum olmuşdur ki, körfəzdə sıfın əksər fərdləri 2 3 yaşında cinsi yetkinlıyə çatır. Yuxarıda qeyd edıldıyı kımi, Azərbaycanın digər su hövzələrində də sıfın cinsi yetkınliyə çatma vaxtında cavanlaşma müşahidə olunur. Bizim fikrimizcə su hövzələrimizdə iri balıqların intensiv ovlanması nətıcəsində sıf populyasiyalarının cırlaşması baş verir və kürütökmədə aşağı yaşlı balıqlar daha çox iştirak edir, onlardan törənən nəsl isə daha tez cinsi yetkinliyə çatır.

Müşahidələriniz zamanı məlum olmuşdur ki, Kiçik Qızılağac körfəzinə kürü tökmək üçün girən cinsi yetkinliyə çatmış sıfların cinsi vəziləri payızın axırlarında IV, fevral-mart aylarında ısə V-VI yetkinlik mərhələsində olmuşdur.

2009-15-ci illərdə korfəzdən ovladığımız sıfların yetkinlik əmsalı oktyabr-noyabr aylarında 3,8-7,4% arasında dəyişərək, orta hesabla 5,1%, fevral mart aylarında isə 7,1-13,5% arasında dəyışərək, orta hesabla 8,7% təşkil etmışdır.

Sıf kürusünü bir dəfəyə tökən balıqlardandır. Bütün balıqlarda olduğu kimi yaş artdıqca onların məhsuldarlığı da artır. Kiçık Qızılağac körfəzində sıfın məhsuldarlığını müəyyən etmək məqsədilə 19 ədəd balığın kurüsü sayılmışdır. Onların məhsuldarlığı 98,7-286,9 min kürü arasında dəyişərək, orta hesabla 156,3±27,3 min kürü təşkıl etmışdır.

Tədqiq etdiyımiz balıqlar arasında eyni yaşda və müxtəlif uzunluqda olan balıqların məhsuldarlığı müxtəlif olmuşdur. Belə ki, yaş və uzunluq artdıqca məhsuldarlıq da artır, lakin eyni yaşda olan daha iri balıqların məhsuldarlığı nisbətən çox olur.

Apardığımız müşahidələrə görə Kiçik Qızılağac körfəzində sıf fevral-aprel aylarında, suyun temperaturu 6,8-13,4°C olduqda, 0,3-1,4 m dərinlikdə, su bitkiləri arasında kürü tökür.

Kiçik Qızılağac körfəzində sıf körpələrinə aprelin axırlarında kütləvi halda rast gəlmək olur. 2011-cı ılın may ayının axırlarında körfəzdən uzunluğu 1,8-4,2 sm, kütləsi 0,33-0,54 q olan 22 ədəd sıf körpəsı ovlanmışdır. Uzunluğu 4,2 sm, orta kütləsi isə 0,52 q olan körpələrin mədəsində balıq kürülərinə rast gəlinmişdir. Bu onu göstərir ki, sıf körpələri fəal qidalanmaya çox tez başlayırlar.

Bizim yanvar-fevral aylarında tədqiq etdiyimiz sıf balıqları dənizdən Kıçik Qızılağac korfəzınə çoxalmaq üçün daxil olduqları üçün onların mədələrində yalnız az miqdarda külmə, şəmayı, aterina və kilkə balıqlarının körpələrinin qalıqlarına rast gəlinmişdir.

Çoxalmada iştirak etdikdən sonra digər balıqlar kımı sıflar da intensiv qıdalanmağa başlayırlar. 2011-ci ilin aprel-may aylarında körfəzdən tədqiq etdıyımız 6 ədəd 37,4-49,6 sm uzunluqda olan sıfların mədəsində olan qidanın 37,4%-i külmə, 24,7%-ı çapaq, 21,6%-i Lənkəran şəmayısı, 16,3%-i isə dıgər balıqlara aid olmuşdur.

Kiçık Qızılağac körfəzində aparılan balıq ovu əsasən iri fərdlərə ıstıqamətləndıyindən, burada ıri sıflara az rast gəlinir. Lakin onu da qeyd etmək lazımdır ki, su hövzələrində böyük yaşlı iri yırtıcı balıqların sayının çox olması iqtisadi cəhətdən ümumiyyətlə sərfəli deyıl, çünkı onlar daha çox vətəgə balığı yeməklə su tutarındakı vətəgə balıqların ümumi ehtiyatına mənfi təsir göstərirlər. Ona görə də Kiçik Qızılağac körfəzində 4-5 yaşlı sıfların ovlanması körfəzin ümumi balıq məhsuldarlığının artmasına səbəb ola bilər.

## ƏDƏBİYYAT


**Абдурахманов Ю. А.** (1962) Рыбы пресных вод Азербайджана. Баку: Элм, 405 с.

**Анохина Л.Е.** (1969) Закономерности изменения плодовитости рыб. М.: Наука, 295 с.

**Ибрагимов Ш.Р.** (2012) Паразиты и болезни рыб Каспийского моря (эколого-географический анализ, эпизоотологическая и эпидемиологическая оценка). Баку: Элм, 415 с.

**Исмаилов Г.Ч.** (1994) Морфо-экологические и физиологические особенности развития Каспийского рыбца в онтогенезе. *Автореф. дис ... канд. биол. наук:* Баку, 27 с.

**Кулиев З.М.** (1989) Рыбы залива Кирова Каспийского моря. Баку: Элм, 184 с.

**Кулиев З.М.** (2002) Карповые и окуневые рыбы Южного и Среднего Каспия. Баку, 215 с.

**Мамедов А.Л., Аббасов Г.С.** (1984) Питание щуки в Малом Кызылагачском заливе. *Изв. АН Азерб.ССР, серия биол. наук*, **4:** 44-48.

**Мамедов А.Л.** (1989) Материалы по динамике численности хищных рыб некоторых водоемов Азербайджана. В материалах II Всесоюзного совещания по проблеме Кадастра и учета животного мира. Россия: Уфа, ***Часть III*:** 356-357.

**Плохинский Н.А.** (1978) Математические методы в биологии. М.: МГУ, 264 с.

**Правдин И.Ф.** (1966) Руководство по изучению рыб. М.: Пищепромиздат, 376 с.

**Сулейманов С.Ш.** (1994) Биология и динамика численности молоди основных промысловых видов рыб Малого Кызылагачского залива *Автореф. дис. ... канд. биол. наук:* Баку, 21 с.

**Чугунова Н.И.** (1958) Руководство по изучению возраста и роста рыб. М.: АН СССР, 164 с.

**Биоэкологические Особенности Судака *Sander Lucioperca* (Linne, 1758) В Малом Гызылагачском Заливе Южного Каспия**

**Э.Х. Таиров, М.М. Ахундов**

*Научно-исследовательский институт рыбного хозяйства Азербайджана*

В процессе ихтиологических исследований, проводимых с 2009 по 2015 годы в Малом Гызылагачском заливе Южного Каспия, было выловлено 119 экз судака *Sander lucioperca* (Linne, 1758), определены их биоэкологические особенности (длина, масса и упитанность тела, возрастной состав, плодовитость и пр.). В связи с тем, что судак является хищной рыбой и в значительной степени влияет на динамику численности популяций мирных рыб, регуляция его запасов имеет важное значение. С этой целью предлагается развитие спиннингового любительского рыболовства в заливе.

***Ключевые слова:*** *Судак, возрастной состав, биоэкологические особенности, упитанность, хищные рыбы, плодовитость, Малый Кызылагач.*

**Bioecological Characteristics of Zander - *Sander Lucioperca* (Linne, 1758) In The Small Gizilagach Bay of South Caspian**

**E.H. Tahirov, M.M. Akhundov**

*Azerbaijan Research Institute of Fisheries*

In 2009-15 in the Small of Bay South Caspian during the ichthyological research, 119 species of zander – *Sander lucioperca* (Linne, 1758) were caught. Their bioecological characteristics (length, weight and body fatness, age composition, length etc.) were identified. Due to the significant impact of zander, which is a predatory fish, on population dynamics of peaceful fishes, the regulation of its reserve is of great importance. To this end, the development of spinning recreational fishing in the bay is proposed.

***Keywords:*** *Pikeperch, age composition, bioecological features, body fatness, predatory fish, fertility, Small Gizilagach.*

Əvvəlki illərdə (1968-2001) Şimali Abşeron korfəzində aparılan tədqiqat işlərinin nəticələri ilə müqayisədə müəyyən olunmuşdur ki, körfəzdə qeyd edılən makrozoobentik orqanizmlərin istər növ tərkibində, istərsə də mıqdarca yayılmasında dəyişiklılər müşahıdə edılmışdir. Belə ki, Şimali Abşeron körfə zində 1968-1972-ci ıllərdə 12-19 növ (biokütlə orta hesabla 84,08 q/m$^2$), 1999-2001-ci illərdə 106 növ (biokütlə orta hesabla 117 q/m$^2$) makrozoobentik orqanizm qeyd edildiyi halda, biz tərəfdən aparılan tədqiqat zamanı (2011-2013-cü illər) isə 46 növ (orta hesabla 103,8 q/m$^2$) orqanizm qeyd edilmişdir. Qeyd edilən bu növlərin 43-ü əvvəlki illərdə qeydə alınan növlərlə eynidir. Əvvəlki illərlə müqayisədə Şimali Abşeron körfəzində makrozoobentik orqanizmlərin növ sayının 2,3 dəfə azalması müşahidə olunmuşdur. Buna əsas səbəb kimi Xəzərin ekoloji vəziyyətinin dəyışılməsi ılə əlaqədar olaraq qarınayaqlı mollyuskaların və azqıllı qurdların növmüxtəlifliyinin azalmasını, həmçinin abıotik və bıotık faktorların təsirıni göstərmək olar.

2008 2012 ci illərdə aparılan tədqiqat işi ilə müqayısədə müəyyən olunmuşdur kı, Şimali Abşeron körfəzdə qeyd edılən 46 növ orqanızmdən 29 növü Cənubi Xəzərin sularında rast gəlinmişdir. Maraqlı cəhət ondan ibarətdir ki, istər Şimali Abşeron korfəzındə, istərsə də Cənubı Xəzərin sahılboyu sularında makrobentık biokütlənin formalaşmasında əsas rol oynayan qrup molyuskalar və dekapodlar, növlərin sayına görə isə üstünlük təşkil edən qrup yanuzən xərçənglər olmuşdur. Lakın Şimali Abşeron körfəzındən fərqli olaraq Cənubi Xəzərin sahılboyu sularında 4 qrupa (*Cuma-cea, Mysidacea, Oligochaeta, İnsecta*) daxil olan orqanizmlərə rast gəlinməmişdir. Bunun əsas sə-bəbi bu zonada trofik şəraitin əlvertişsiz olması ılə əlaqədardır

**ƏDƏBİYYAT**


**Mirzəyev G.S.** (2008) Xəzərin Abşeron yarımadasının sahilboyu sularında bentık orqanızmlərın və çanaqlı xərçənglərinin növ tərkibi və yayılması. *Zoologiya İnstitutunun əsərləri,* **XXVIII:** 551 558.

**Mirzəyev G.S.** (2012) Orta Xəzərın Şımali Abşeron körfəzinin mikro- və makrozoobentosu (növ tərkıbi və yayılması). *Zoologiya İnstitutunun əsərləri,* **30 (1):** 167-171.

**Süleymanova İ.Ə.** (2006) Xəzərın Şimalı Abşeron körfəzi maktozoobentosunun növ tərkibi, yayılması və inkişaf dinamikası. *Zoologıya İnstıtutunun əsərləri,* **XXVIII:** 855-867.

**Алиев А.Д.** (1968) Видовой состав и распределение зообентоса Среднего и Южного Каспия. В сб.: *Биол. Среднего и Южного Каспия.* М.: Наука: 80-104

**Атлас беспозвоночных Каспийского моря** (1968) М.: Пищепром., 413 с.

**Бентос Азовского моря** (1949). *Тр. АзЧер. НИРО,* **вып. 3:** 1 49.

**Гасанова В.М.** (1972) Сезонные изменения численности и биомассы зообентоса западного побережья Южного Каспия. *Биол. Ресурсы Каспийского моря.* Астрахань: 60-64.

**Касымов А.Г.** (1987) Животный мир Каспийского моря. Баку: Элм: 156 с.

**Касымов А.Г.** (2000) Макробентос. В кн.: *Методы мониторинга в Каспийском море.* Баку: “QAPP-Poliqraf”: 35-38.

**Определитель фауны Черного и Азовского морей** (1969) Т. II, Ракообразные. Киев: 536 с.

**Романова Н.Н.** (1983) Методические указания к изучению бентоса Южных морей СССР. М., ВНИРО: 13 с.


**Макрозообентос Северного Апшеронского Залива Каспия**


**Г.С. Мирзоев[1], А.Р. Алиев[2]**

[1] *Азербайджанский государственный экономический университет-UNEC*
[2] *Институт зоологии НАН Азербайджана*



Статья посвящена динамике видового состава и количественного развития макрозообентоса. Выявлены относящиеся к 9 систематическим группам 46 видов макрозообентоса, 3 из которых (*İ.mıchaelsenı, A spinoza, C marinus*) впервые отмечены для фауны залива. В период исследований самое большое разнообразие видов отмечено в весенне-летний сезон (30 46 видов), а слабое осенью (25 30 видов). Среднегодовая биомасса изменялась в пределах 95,66 107,92 г/м$^2$, а численность - 1217 1453 особ /м$^2$ Максимальное развитие биомассы отмечено летом - 122,88 139,14 г/м$^2$, а минимальное осенью 71,49 81,23 г/м$^2$.



***Ключевые слова:*** *Северный Апшеронский залив, макрозообентос,, биомасса, макрозообентические организмы, видовое разнообразие*

**The Macrozoobenthos Of The Northern Absheron Gulf Of The Caspian Sea**

**G.S. Mirzoyev[1], A.R. Aliyev[2]**

[1] *Azerbaijan State Economical University (UNEC)*
[2] *Institute of Zoology, Azerbaijan National Academy of Sciences*

The article is devoted to the study of the dynamics of species composition and quantitative development of macrozoobenthos of the Northern Absheron Gulf of The Caspian Sea, in 2011-2013. Forty-six macrobenthic species included 9 taxonomic groups were found in the Northern Absheron Gulf. Three of them (*İ.michaelseni, A spinoza, C.marinus*) were revealed for the first time in the fauna of the Gulf. The maximum species diversity was observed in spring and summer seasons (30 - 46 species), and minimum - in autumn (25 - 30 species). The average annual biomass was ranged from 95.66 - 107.92 g/m$^2$, and the total number - 1217 - 1453 ind. m$^2$. Maximal development of biomass was observed in summer - 122.88 - 139.14 g/m$^2$, and the minimum - in autumn - 71.49 - 81.23 g/m$^2$.

***Keywords:*** *Northern Absheron Gulf, macrozoobenthos, biomass, macrozoobenthic organisms, species diversity*

AMEA nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh. 98 104 (2017)

# Yumşaq Buğda (*Triticum aestivum* L.) Genotiplərində *TdicDRF1* Geninin Tək Nukleotid Polimorfizmləri (TNP) Əsasında Müqayisəli Tədqiqi

**C. Mürsəlova*, Z.İ. Əkpərov**

*AMEA Genetik Ehtiyatlar Institutu, Azadlıq prospekti, 155, Bakı AZ1106, Azərbaycan;*
**E-mail: m.jamala85@gmail.com*

**Tədqiqat işində 48 payızlıq yumşaq buğda genotipində TdicDRF1 (ABA- asılı olmayan) transkripsiya faktorunu kodlaşdıran genin skrininqi aparılmış və bir hissəsinin sekvenslənməsi yerinə yetirilərək tək nukleotid polimorfizmlərinə görə müqayisə edilmişdir. Tədqiq olunan nümunələrin amplifikasiya olunmuş gen fraqmentində ümumilikdə, 94 tək nukleotid polimorfizmi (TNP) müəyyən olunmuşdur ki, onlardan 48-i tranzisiya, 27-si isə transversiya tipli TNP-lərə aid olub, ümümi polimorfizmin müvafiq olaraq 51 və 29%-ni təşkil etmişlər.**

***Açar sözlər:*** *TNP, sekvens, transkripsiya amili, abssiz turşusu, TdicDRF1*

## GİRİŞ

Quraqlıq ən şiddətli stres amıllərindən olub, bitkilərin, demək olar ki, bütün funksiyalarına təsir göstərir. Bitkilərdə quraqlıq stresinə qarşı cavab reaksıyasında iştırak edən gen məhsulları 2 əsas qrupa ayrılır: funksional və tənzimləyici zülallar. Birinci qrupa aid olan genlərin əsas funksiyası stresə tolerantlığı təmin edən zülalları sintez etməkdir (su kanal proteinləri, osmotik qoruyucuların biosintezində iştirak edən enzimlər, LEA (gec embriogenez) zülalları və s.). İkinci qrupa ısə stresə qarşı cavabda rol oynayan, genlərin ekpresiyasının və siqnal ötürülməsinin tənzimlənməsini həyata keçirən proteinkinazlar, transkrıpsiya amilləri (bZIP, MYC, MYB and DREB) və s. zülallar daxildir (Əliyev və b., 2014; Shinozaki and Yamaguchı 1997).

Bitkilərin quraqlıq stresinə reaksiyasının transkripsiya səviyyəsində tənzimlənildıyı məlumdur. Bu stres amilinin təsiri zamanı transkripsiya səviyyəsində tənzimlənmənin abssiz turşusundan asılı (ABT asılı) və yaxud aslı olmayan (ABTasılı olmayan) və DREB zülalları vasitəsilə icra olunan (dehydration-responsive element binding protein) 2 əsas tsikli induksiya olunur (Irada et al., 2010; Hikmet et al., 2013).

Məlumdur ki, abssiz turşusu (ABT) bitkilərin inkışaf proseslərində iştırak etməklə, streslə əlaqəli yolları induksiya edən bitki hormonudur. O, su stresi şəraitində sintez olunur və quraqlığa qarşı tolerantlıqda əhəmiyyətli rol oynayır (Hikmet et al., 2013). ABT-nin quraqlığa davamlılığı artırdığı, yaşlaşmanı gecikdirdiyi, fizioloji və ya mühit quraqlığında bitkılərin canlı qalmasını təmin etdiyi tədqıqatlarla sübut edilmişdir (Shınozaki and Yamaguchi, 2000).

ABT-dan asılı yolda əsasən antioksıdləşdirici və osmotik qoruyucular iştirak etdiyi halda, ABT-dan asılı olmayan yolda əsas rolu qoruyucu zülalar oynayır. ABT-dan asılı olmayan yol həm də DREB vasitəli yol adlanır və əsasən suzuzluğa cavabdeh elementləri birləşdirən (DREB)/C-təkrarları motivləri (CRT) zülallarını özündə cəmləyir. Onlardan *DREB1* transkrıpsıya faktoru əsasən soyuq stresinə, *DREB2* isə quraqlıq stresinə qarşı reaksiyada iştirak edir (Agarwal et al., 2006). Onlar transkripsıya amillərinin ERF (ethylene responsive element binding factors) qrupuna məxsusdurlar. *Arabıdopsis* bıtkisində 124-dən çox ERF zülalları olduğu müəyyən edilmişdir (Riechmann et al., 2000). DREB2-nin homoloqu olan *TdicDRF1* transkrıpsiya faktoru ilk dəfə yabanı buğdalarda (*T. turgidum* ssp. *Dıcoccoides*)müəyyən edılmiş, klonlaşdırılmış və xarakterizə edilmişdir (Lucas et al., 2011). Quraqlıq stresinə həssas və davamlı genotiplərin müqayisəsi nəticəsində *TdicDRF1* transkripsiya amilinin müxtəlif cür ekspresıya olunduğu müəyyən edılmişdir. Beləlıklə, həmın transkripsıya amilinin quraqlıq stresinə cavab reaksiyasında rolu nəzərə alınaraq quraqlığa tolerant buğda sortlarının yaxşılaşdırılmasında istifadə oluna bilər (Hikmet et al., 2013; Lucas et al., 2011).

Məlumdur ki, tək nukleotid polimorfizmləri (TNP) istənılən növün fərdləri arasında müşahıdə edilən ən ümumi polimorfizm növüdür (Brookesç 1999; Deschamps and Campbell, 2010). TNP-lərin kəşfi, onların genetik marker kimi istifadəsi yüksək keyfiyyətli analizlərin aparılmasına və TNP-lər vasitəsilə genotipik qiymətləndirmə platformalarının inkişafına səbəb olmuşdur (Edwards et al, 2008;, Ganal et al., 2009; Varshney et al., 2009).

Tədqiqat işində əsas məqsəd 48 müxtəlif mənşəli yumşaq buğda genotipində quraqlığa davamlı *TdicDRF1* transkripsiya amilini kodlaşdıran genin mövcudluğunun yoxlanılması və gendə tək nukleo tid polimorfizmlərinin (TNP) müəyyən edilməsindən ibarət olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat materialı Buğda və Qarğıdalının Yaxşılaşdırılması üzrə Beynəlxalq Mərkəzdən (CYMMIT) əldə olunmuş müxtəlif mənşəli 48 payızlıq yumşaq buğda genotipindən (sort və yaxşılaş dırılmış xətlər) ibarət olmuşdur (Cədvəl 1). Buğda nümunələrindən DNT-nin ayrılması Varşava Təbiət Elmləri Universitetinin (SGGW) "Molekulyar biologiya" laboratoriyasında, Thompson və Murray təklif etdiyi və sonradan modifikasiya olunmuş CTAB (Cetyltrimethyl ammonium bromide) protokolu əsasında yerinəyetirilmişdir (Murray and Thompson, 1980).Ayrılmış DNT-nin keyfiyyəti və qatılığı Nanodrop 2000 cihazı ilə təyin edilmiş və tələb olunan qatılıq üzrə durulaşdırılmışdır (5 ng/µl).

PZR reaksiya qarışığının ümumi həcmi bir nümunə üçün 15µl olmuşdur. Hər reaksiya qarışığı 5ng/µl DNT, 1XPZR ***(1X Green GoTaq*®** Reaction ***Buffer)*** buferi (0,5 mM $MgCl_2$, 0,2 mM dNTP-lər, 0,2 mM düzünə, 0,2 mM əksinə praymer, 0,02 U/µl Taq polimeraza fermentindən ibarət olmuşdur. Zəncirvarı Polimeraza Reaksiyası (APPLIED, Gene Amp., PCR System 9700) aparatında 3 mərhələdən və 37 tsikldən ibarət proqram əsasında yerinə yetirilmişdir.

PZR reaksiyası tamamlandıqdan sonra reaksiya məhsulu 1%-li aqaroza gelində və 220 V gərginlikdə, 40-45 dəqiqə müddətində elektroforez olunmuşdur. Gellər Molecular Imager®Gel Doc™ XR system (Bio-Rad) cihazı vasitəsilə UV şüaları altında görüntülənmışdır.

*TdicDRF1* transkripsiya amilinə müvafiq praymerlərin dizayn olunması üçün həmin genin NCBI (Milli Biotexnologiya İnformasiya Mərkəzi) məlumat bazasında mövcud olan mRNA ardcıllığından (GenBank: HM015905.1) istifadə olunmuşdur. Tədqiq olunan geni tam əhatə etmək üçün Primer3 (http://primer3.ut.ee) proqramının istifadəsi ilə bir-birinin üzərini örtən (overlapping) 3 müxtəlif praymer dizayn edilmişdir. Dizayn olunmuş praymerlərin keyfiyyəti Oligoanalyzer (https://www.idtdna.com/calc/analyzer) və Primer Stat (http://www.biomol.unb.br/sms2/pcr primer stats.html) proqramları ilə yoxlanılmışdır. Şərti olaraq 1ABA, 2ABA və 3ABA adlandırılmış praymerlər Genomed şirkətindən əldə edilmiş və protokola uyğun olaraq durulaşdırılmışdır. İstifadə olunmuş praymerlərin siyahısı Cədvəl 2-də verilmişdir.

Genin 3ABA praymeri vasitəsilə amplifikasiya olunmuş 3′ sonluğuna yaxın fraqmenti Genomed şirkətində, Sanger metodu ilə sekvens olunmuşdur. Əldə olunmuş nəticələr *Chromas LITE 2.1.1*, CAP3, MEGA6, Tassel 5 və BioEdit kimi bioinformatik proqramların köməyilə analiz edilmişdir.

**Cədvəl 1.** Tədqiqat işində istifadə olunmuş 48 payızlıq yumşaq buğda genotipləri

| № | Nümunələr | Mənşəyi | № | Nümunələr | Mənşəyi |
|---|---|---|---|---|---|
| 1. | SG-U 8069 | CZ | 25. | COMP1/5/BEZ/TOB/8156.4/ON/3/TH*6/KF//LEE *6/K 6/TAST/SPRW /7 ALTAY/8/BURBOT 6 | TCI |
| 2. | GOBUSTAN | AZB | 26. | AGRI/NAC ATTILA | MX CIT |
| 3. | KRASNOVODOPADSKAYA 211 | KAZ | 27. | DESTIN | RO-FL |
| 4. | PROSTOR | BG | 28. | DEMIR | TR ANK |
| 5. | GEREK | TR ESK | 29. | DYUOPEBUSA | MOL |
| 6. | UBILEYNAYA 100 | RUS-KR | 30. | OK00421 | USA-OK |
| 7. | BAYRAKTAR | TR-ANK | 31. | ALTAY | TR-ESK |
| 8. | HAMSI I | MX TCI | 32. | AKINCI 84 | AZB |
| 9. | BEZOSTAYA1 | TR-ESK | 33. | GRS1201/TAM202 | US-ARS-Lincoln |
| 10. | KARAHAN | TR-KON | 34. | MIMA | BG |
| 11. | MVMA/MV12 /F2098 | HU MV | 35. | NIKONIYA | UKR OD |
| 12. | STARSHINA | RUS-KR | 36. | LC924/PETJA | UKR-OD |
| 13. | CO 970547-7 | USA-CO | 37. | PODOIMA | BG-SAD |
| 14. | ZUBKOV | KYR | 38. | STEKLOVIDNAYA24 | MOL |
| 15. | MV06-02 | HU-MV | 39. | DALNITSKAYA | KAZ |
| 16. | GLORIA | RO-FL | 40. | VITA | UKR |
| 17. | LC 909 MIMA | BG-KC | 41. | KHARKOVSKAYA107 | RUS-KR |
| 18. | TX96V2847 | US-TX | 42. | AZERI | AZB |
| 19. | U1254-1-8-1-1/TAM-202 | USA-TX | 43. | 453 | KAZ |
| 20. | SONMEZ | TR-ESK | 44. | SG-S1915 | CZ |
| 21. | ARLIN/YUMA | USA-KSU | 45. | MADSEN MALCOLM | OSU |
| 22. | ERITR 9945 | KYR | 46. | 7C/CNO /CAL/3 YMH/4/VP... | OSU |
| 23. | GRUIA | RO-FL | 47. | ID 80-628.3/CER/YMH .. | OSU |
| 24. | MV DALMA | HU MV | 48. | U1254 7 9 2 1/TX86A5616/RINA 6 | TCI |

**Cədvəl 2.** Dizayn edilmiş praymerlər və onların əsas göstəriciləri

| **GenBank: HM015905.1** | | | | | |
|---|---|---|---|---|---|
| *Triticum turgidum* subsp. *dicoccoides* DRE-binding transcription factor 1.3 mRNA, complete cds | | | | | |
| | | | **Praymer: 1ABA** | | |
| **Praymer** | **Başlandığı mövqe** | **uzunluq** | **$T_m$** | **GC%** | **Ardıcıllıq 5′ - 3′** |
| Düzünə praymer | 2 | 22 | 67.77 | 59.09 | TGACGGTAGATCGGAAGGACGC |
| *Self dimer* | | | | | Delta G 4,62 kkal mol |
| Əksinə praymer | 333 | 22 | 63.55 | 50.00 | CCTCTTTGAACCCTGTGGATCA |
| *Self dimer* | | | | | Delta G: -4,62 kkal/mol |
| *Hetero dimer* | Delta G -4,67 kkal/mol | | | | |
| İlgək | əmələ gətirmir | | | | |
| | | | **Praymer: 2ABA** | | |
| **Praymer** | **Başlandığı mövqe** | **uzunluq** | **$T_m$** | **GC%** | **Ardıcıllıq 5′ - 3′** |
| Düzünə praymer | 312 | 22 | 63.55 | 50.00 | TGATCCACAGGGTTCAAAGAGG |
| *Self dimer* | | | | | Delta G: -4,62 kkal/mol |
| Əksinə praymer | 751 | 22 | 60 10 | 50 00 | CATCTGGCTGGGAGTAAATCTC |
| *Self dimer* | | | | | Delta G: -3, 17 kkal/mol |
| *Hetero dimer* | Delta G. -5,02 kkal/mol | | | | |
| İlgək | əmələ gətirmir | | | | |
| | | | **Praymer: 3ABA** | | |
| **Praymer** | **Başlandığı mövqe** | **uzunluq** | **$T_m$** | **GC%** | **Ardıcıllıq 5′ - 3′** |
| Düzünə praymer | 730 | 22 | 60 10 | 50.00 | GAGATTTACTCCCAGCCAGATG |
| *Self dimer* | | | | | Delta G 3,17 kkal mol |
| Əksinə praymer | 1150 | 21 | 60.00 | 47.62 | ACTCGCTCATCTCAGCATCAT |
| *Self dimer* | | | | | Delta G: -4,74 kkal mol |
| *Hetero dimer* | Delta G 6,6 kkal mol | | | | |
| İlgək | əmələ gətirmir | | | | |

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Məlum olduğu kimi hazırda genomiks haqqında məlumatlar müxtəlif açıq girişli-ictimai və girişi məhdudlaşdırılmış fərdi məlumat bazalarında saxlanılır. Ən çox istifadə edilən və ictimaiyyət üçün açıq olan məlumat bazası Milli Biotexnologiya İnformasiya Mərkəzi (MBİM-NCBİ) tərəfindən idarə olunur. Tədqiqat işində, ilk növbədə öyrənilən genin amplifikasiyası məqsədilə buğdanın *Triticum turgidum* subsp. *dicoccoides* yarım-növünün *TdicDRF1* transkripsiya amilinin 1167 nukleotid cütündən ibarət olan mRNT-nin ardıcıllığı (GenBank: HM015905.1) MBİM məlumat baza sından yüklənilmiş və üç hissəyə ayrılaraq müəyyən sahələrdə bir-birinin üzərini örtən (overlapping) üç cüt praymer dizayn edilmişdir (Cədvəl 2). Məlumdur ki, hər bir PZR reaksiyasının səmərəliliyi və həssaslığı istifadə olunan praymerin keyfiyyətindən çox asılıdır. Belə ki, praymerlərin uzunluğu, birləşmə temperaturu, GC tərkibi və ardı cıllığı və s. əsas göstəricilər hesab olunduğundan, onların dizayn edilməsi zamanı bütun qeyd olunanlar nəzərə alınmış, düzünə və əksinə praymerlərin özləri (*self dimer*) və ya bir-birləri ilə (*hetero dimer*) dimer, həmçinin ilgək (*hairpin*) əmələ gətirmə ehtimalları yoxlanılmışdır (Singh and Kumar, 2001). İlkın olaraq praymerlər 10 ədəd müxtəlif mənşəli buğda genotiplərində tədqiq olunan genin amplifikasiyası üçün istifadə edilmiş və aqaroza gelində alınmış nəticələrə əsasən 1ABA paymeri vasitəsilə sintez olunmuş fraqmentlərin uzunluğunun 2000-3000 n.c., 2ABA və 3ABA praymerləri vasitəsilə sintez olunmuş fraqmentlərin uzunluğunun isə 300-400 n.c.-ə bərabər olması müəyyənləşdirilmişdir. Bu isə birinci fraqmentin həm intron və ekzonlardan ibarət oldugunu söyləməyə əsas vermişdir. Digər sintez olunan fraqmentlərin uzunluğu isə praymerlərin dizayn edilməsi zamanı gözlənilən uzunluğa bərabər, yəni yalnız mRNT-də təmsıl olunan müəyyən bir hissəyə uyğun olmuşdur ki, bu da onların yalnız genin hər hansısa bir ekzonuna aid hissəni əhatə etməsini göstərir. Növbəti mərhələdə tədqiq olunan 48 nümunənin hamısında hər üç praymerin istifadə silə *TdicDRF1* geninin olub-olmaması yoxlanılmış və nəticədə bütün genotiplərdə qeyd edilən genin amplifikasiyasının getməsi müşahidə edilmişdir. Bütün tədqiq olunan buğda genotiplərində *TdicDRF1* genının mövcudluğu aşkar edildıkdən sonra genin 3′ sonluğundakı təxminən 424 n.c. uzunluqlu fraqmentinin Sanger üsulu əsasında hər iki istiqamətdə (düzünə və əksinə zəncirlərin hər biri) sekvenslənməsi həyata keçirilmişdir.

Alınmış xromatoqramlardahəqiqi polimorfizm ilə sekvensin xətası *Chromas LITE 2.1.1* kompyuter proqramı vasitəsilə müəyyənləşdirilmişdir. Belə ki, sekvens üçün istifadə olunmuş DNT-nin keyfiyyəti və ya miqdarı aşağı olduqda, yaxud oxunuşda hər hansı bir xəta baş verdikdə bu proses xromatoqramdakı dalğalarda əlavə simvollar şəklində öz əksini tapır (məsələn N, Y və s.).



**Şəkil 1.** 3ABA praymeri vasitəsilə amplıfikasiya olunmuş franqmentlər.



**Şəkil 2.** Tək nukleotid polimorfizminin (TNP) müəyyən edilməsi, *TASSEL 5.0.8*.

Daha sonra fraqmentin düzünə və əksinə istiqamətdə oxunmuş eyni fraqmentləri FASTA formatına salınaraq *CAP3* proqramından istifadə edilməklə kontiqlər (contigs-contiguous sequences) əldə olunmuş və bütün nümunələrin kontiqləri *BioEdit Sequence Alignment Editor* proqramı vasitəsilə düzləndirilmişdir (alignment). Sonra *TASSEL 5.0.8* bioinformatik proqramının istifadəsi ilə bütün öyrənilən genotiplərin eyni gen fraqmentində tək nukleotid polimorfizmləri (TNP) müəyyən edilmişdir. Tək nukleotid polimorfizmlərinə daha çox genomun kodlaşdırmayan hissələrində rast gəlinsə də, kodlaşdırıcı və ya tənzimləyici funksiyalı regionlarda da müşahidə olunurlar. Gendəki yerinə görə TNP-lər exon, intron və promotor TNP-lər kimi fərqləndirilir. Kodlaşdırıcı sahələrdəki bu cür muxtəlifliklər isə sinonim və qeyri-sinonim TNP-lər kimi təsnifləşdirilir. Qeyri-sinonim TNP-lər zülal ardıcıllığında həmin kodonun kodlaşdırdığı amin turşularının dəyişməsinə səbəb olur və bu dəyişiklik amin turşularının xarakterindən asılı olaraq konservativ və qeyri-konservativ olur. Qeyri-konservativ dəyişiklik yaradan polimorfizm, zülallarda struktur dəyişikliyinə səbəb ola bilər ki, bu da nəticədə onların funksiyasını dəyişir. Sinonim tipli mutasiyalar zamanı yaranan polimorfizm zülalda amin

turşularının dəyişilməsinə səbəb olmur. Nuk-leotidlərin variasıyasına əsasən isə TNP-lərın 2 növu məlumdur: tranzisiya və tranversiya. Tranzisiya zamanı purınlər purinə (A G), prımıdınlər ısə primidinə çevrilir (C T). Transversiya tipli dəyışilmə zamanı isə (A C, A T, G C, G T) purınlər primi dınə, prımıdınlər ısə purinə çevrılır.

3ABA praymeri vasitəsilə amplifikasiya olunmuş 424 n.c.-dən ibarət gen fraqmentində ümumilikdə 94 TNP müəyyən edilmişdir (Cədvəl 3, ixtisarla). Bunlardan 48-i tranzisiya tipli TNP-lərə aıd olub umümi polimorfizmin 51%-ni, 27-i isə transversiya tipli TNP-lərə aid olub 29%-ni təşkil etmişdir. Həmçinin öyrənilən fraqmentin 342 və 369 n.c. mövqelərındə 2 İnDel (insersiya və yaxud delesiya), 17 halda isə bir nukleotidin 3 fərqli nukleotıdlə əvəz olunması müşahidə olunmuşdur (məs. A/T/C). Nəzəriyyədə qeyd olunur ki, nukleotid transversıyalarının sayı tranzisıyaların sayından 2 dəfə çoxdur, əksinə tranzisiyaların rastgəlmə tezlıyı 1,5-2,5 ədəd transversiyaların tezliyindən yüksəkdir. Bu ısə CpG dinukleotıdlərində 5-metilsıtozinin timidinə görə yüksək spontan deaminləşmə (amin qrupunun ləğv edilməsi) səviyyəsı ılə izah oluna bilər (Khlestkina and Salina 2006).

**Cədvəl 3.** Gen fraqmentində müəyyən edılmiş Tək Nukleotıd Polımorfizminın (TNP) mövqeyi (ixtisarla)

| TNP-nin növü və mövqeyi | TNP-lərin rast gəlmə tezliyi | Genotiplər üzrə nukleotid əvəzedilmələri |
|---|---|---|
| T/A (1) | 27/21 | T<br>G 2, 4; 5; 6; 7, 9, 10; 11; 12; 13, 14, 15, 16, 18, 19; 21; 23, 24; 27; 30; 34; 35; 36, 38, 41, 42, 48 |
| | 56% T<br>44% A | A<br>G 1, 3; 8, 17, 20, 22; 25, 26; 28; 29; 31, 32, 33, 37, 39, 40; 43; 44, 45, 46; 47 |
| T/G (2) | 31 17 | T-<br>G1; 2, 7; 9, 10; 14, 15, 17; 19; 20, 21; 25; 26; 27, 28, 29, 31, 34, 35; 36; 37, 39, 40; 41, 42, 43, 44, 45, 46, 47; 48 |
| | 65% T<br>35% G | G<br>G3, 4, 5; 6, 8, 11; 12; 13; 16, 18, 22, 23, 24, 30, 32; 33; 38 |
| T/C (10) | 43 5 | T-<br>G 1-10; 13-19; 21-29; 31-33; 35-48 |
| | 90% T<br>10% C | C<br>G11, 12, 20, 30, 34 |
| G/T (17) | 45/3 | G-<br>G 1-2; 4-7; 9-37; 39-48 |
| | 94% G<br>6% T | T<br>G 3, 8; 38 |




**Şəkil 3.** TNP lər əsasında 48 yumşaq buğda genotıpının klaster analizı vasıtəsilə qruplaşdırılması

MEGA6 bioinformatik proqramı vasitəsilə gen fraqmentində müəyyən edilmiş TNP-lər əsasında Kimura 2-parameter metodundan istifadə edilməklə genetik məsafə matrisi qurulmuşdur. Neighbor-Joining metodu və klaster analizinin nəticəsində tədqiq olunmuş 48 yumşaq buğda genotiplərinin 424 n.c. uzunluqlu sekvesnlərində mövcud olan TNP-lər nümunələri 2 əsas və 5 yarım-klasterə ayırmışdır.

1-ci yarımqrup klaster müxtəlif mənşəli 13 genotipi birləşdirərək, umumi genotiplərin 27,1%-ni təşkil etmişdir. Bu qrupda genetik məsafə indeksinə görə genetik oxşarlıq əmsalının minimum və maksimum qiymətləri müvafiq olaraq 0,012-0,061 arasında dəyişmişdir. Belə ki, yarımqrup daxilində genetik məsafə baxımından ən yaxın genetik oxşarlıq 0,012 qiymətində 6-cı (Ubileynaya 100) genotiplə 24-cü (Mv Dalma) genotip arasında, ən uzaq genetik məsafə isə 0,061-ə bərabər genetik məsafədə 5-ci (Gerek) genotiplə 33-cü (Grs1201/Tam202) genotip arasında aşkar edilmişdir. Genetik məsafə baxımından bir birinə oxşar (və ya yaxın) olan münunələrin nukleotid ardıcıllığına və TNP tərkibinə nəzər saldıqda, 24 nömrəli genotiplə 6 nömrəli genotipin müqayisəli analizi zamanı 5 TNP (3 transversiya - 60%, 2 tranzisiya - 40%) müəyyən edilmişdir. Göstərilən genotiplərin 424 n.c. uzunluqlu fraqmentlərində eyni nukleotid mövqelərində tək nukleotid əvəzlənməsi (TNP) həmin nümunələri eyni klasterdə birləşdirərək onların genetik oxaşarlığını gostərmişdır. Genetik məsafə indeksinə əsasən bir-birindən uzaq olan münunələr TNP-lərin sayına görə daha çox fərqlənmişlər. Belə ki, 5-ci genotiplə 33-cü genotip arasında 24 TNP müəyyən edilmiş-dir. Bunlardan 70,8%-nin (17) transversiya, 29,2%-nın (7) isə tranzisiya tipli TNP-lər olduğu müəyyən edilmişdir. 2-ci yarım qrup umumılıkdə 10 genotipi əhatə etmişdir ki, bu da 48 genotipin 21,7%-ni təşkil etmişdir. 3-cü yarım qrup genotiplərin 8,3% ni təşkil edərək, cəmi 4 nümunədən (G20, G28, G35, G41) ibarət ən kiçik klaster kimi qiymətləndirilmişdir. Yarımqrup daxilində genetik oxşarlıq 0,012-0,024 səviyyələrində dəyişmişdir. Qeyd etmək lazımdır ki, bu yarımqrupda geniş hududlu variasiya müşahidə edilməmiş, belə ki, genotiplər bir-birindən çoxda fərqlənməmişdir. Həmçinin yarımqrupa daxil olan digər genotiplərin nukleotid ardıcıllığını müqayisə etdikdə də müvafiq olaraq 6-7 TNP (tək nukleotid əvəzlənməsi) müşahidə edilmişdir. 4-cü yarımqrup 8 genotipdən ibarət olmaqla, ümumi dendroqramın 16,7%-ni, 5-ci yarım-qrup isə 13 genotipi əhatə etməklə, dendroqramın 27,1% ni təşkil etmişdir. Beləliklə, klaster analizi genotipləri TNP-lərin sayı əsasında qruplaşdırmışdır. Belə ki, TNP-lərin miqdarının (tək nukleotid əvəzlənməsi) azlığı genotipləri oxşar, çox olması isə onları uzaq genotiplər kimi ayırmışdır.

Gələcək tədqiqatlarımızda biz müəyyən etdiyimiz TNP-lərdən istifadə edərək TNP əsaslı praymerlər dizayn edə bilər və həmin praymerlərdən quraqlığa davamlı buğda sortlarının qiymətləndirilməsində, eyni zamanda seleksiya proqramlarında istifadə edə bilərik.

## MİNNƏTDARLIQ

Tədqiqat işi Avropa Komissiyası tərəfindən maliyyələşdirilən Erasmus Mundus 2-ci Fəaliyyət Proqramı çərçivəsində elan olunmuş ALRAKIS II layihəsi əsasında yerinə yetirilmişdir. Tədqiqat işinin həyata keçməsində dəstəyi olan Varşava Təbiət Elmləri Universitetinin (SGGW) Professoru Monika Rakoczy Trojanowskaya və institutun "Bitki seleksiyası, Genetikası və Biotexnologiyası" şöbəsinin əməkdaşlarına təşəkkür edirik.

## ƏDƏBİYYAT SİYAHISI

**Əliyev R.T., Abbasov M.Ə., Rəhimli V.R.** (2014) Stres və bitkilərin adaptasiyası. Bakı: Elm, 348 s.

**Agarwal P.K., Agarwal P., Reddy M.K., Sopory S.K.** (2006) Role of DREB transcription factors in abiotic and biotic stress tolerance in plants. *Plant Cell Reports*, **25(12):** 1263 1274.

**Brookes A.** (1999) The Essence of SNPs. *Gene*, **234:** 177 186.

**Deschamps S., Campbell M.** (2010) Utilization of next-generation sequencing platforms in plant genomics and genetic variant discovery. *Mol. Breed.*, **25(4):** 553 570.

**Edwards K.J., Poole R.L., Barker G.L.A.** (2008) SNP discovery in plants. In: Henry R.J. (ed) *Plant genotyping* II: *SNP Technology*. Wallingford, Oxfordshire, pp. 1 29

**Ganal M.W., Altmann T., Röder M.S.** (2009) SNP identification in crop plants. *Curr. Opin. Plant Biol.*, **12:** 211 217

**Hikmet B., Melda K., Kuaybe Y.K.** (2013) Drought Tolerance in Modern and Wild Wheat. *The Scientific World Journal, Review Article ID 548246*, **2013:** 16 p.

**Huseynova I.M., Rustamova S.M.** (2010) Screening for drought stress tolerance in wheat genotypes using molecular markers. *Proceedings of ANAS (biological Sciences)*, **65(5-6):** 132-139

**Khlestkina E.K., Salina E.A.** (2006) SNP markers: methods of analysis, ways of development, and comparison on an example of common wheat. *Genetika*, **42:** 725-730.

**Lucas S., Durmaz E., Akpnar B.A., Budak H.** (2011) The drought response displayed by a DRE-

binding protein from *Triticum dicoccoides*. *Plant Physiology and Biochemistry*, **49(3):** 346–351.

**Murray M.G., Thompson W.F.** (1980) Rapid isolation of high molecular weight plant DNA. *Nucleic Acids Res.*, **8:** 4321-4326.

**Riechmann J.L., Heard J., Martin G. et al.** (2000) *Arabidopsis* transcription factor: genome wide comparative analysis among eukaryotes. *Science,* **290:** 2105 2110

**Shinozaki K., Yamaguchi-Shinozaki K.** (1997) Gene expression and signal transduction in water-stres response. *Plant Physiol.,* **115:** 327-334.

**Shinozaki K., Yamaguchi-Shinozaki K.** (2000) Molecular responses to dehydration and low temperature: differences and cross-talk between two stress signaling pathways. *Curr. Opin. Plant Biol.,* **3:** 217 223/

**Singh V.K., Kumar A.** (2001) PCR primer design. *Mol. Biol. Today,* **2:** 27-32

**Varshney R.K., Spurthi N., Nayak S., May G.D., Jackson S.A.** (2009) Next-generation sequencing technologies and their implications for crop genetics and breeding. *Trends Biotechnol.,* **27:** 522 530.

## Сравнительное Изучение Гена TdicDRF1 Различных Генотипов Мягкой Пшеницы (*Triticum aestivum* L.) На Основе Однонуклеотидных Полиморфизмов (ОНП)

**Д. Мурсалова, З.И. Акпаров**

*Институт генетических ресурсов НАН Азербайджана*

48 генотипов мягкой озимой пшеницы были подвергнуты скринингу на присутствие гена TdicDRF1, кодирующего фактор транскрипции (ABA-независимый). После частичного секвенирования их сравнивали на однонуклеотидный полиморфизм. В амплифицированных фрагментах гена исследуемых образцов в общей сложности было выявлено 94 одиночных нуклеотидных полиморфизма (ОНП), 48 из которых принадлежали к транзиционному, а 27 - к трансверсному типам, представляющим соответственно 51% и 29% от общего полиморфизма.

***Ключевые слова:*** *ОНП, секвенирование, транскрипционный фактор, абсцизовая кислота, TdicDRF1*

## Comparative Study Of Different Soft Wheat (*Triticum aestivum* L.) Accessions Based On The Single Nucleotide Polymorphism (SNP) Of The TdicDRF1 Gene

**J. Mursalova, Z.I. Akparov**

*Institute of Genetic Resources, Azerbaijan National Academy of Sciences*

In this study 48 genotypes of bread winter wheat were screened for the presence of the gene TdicDRF1 (ABA-independent) coding the transcription factor and after the partial sequencing they were compared by single-nucleotide polimophism. In total, 94 single nucleotide polimophisms (SNPs) were identified in the amplified gene fragments of the studied samples and 48 of them belonged to transition, 27 to transversion type of SNPs, representing accordingly 51% and 29% of the total polimophism.

***Key words:*** *SNP, sequence, transcription factor, abscisic acid, TdicDRF1*

*AMEA nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh. 105 110 (2017)*

# Kiçik Qafqazın Şimal-Şərq Hissəsində Yayılan Bəzi Qıjıkimilərin Yeni Yayılma Sahələri Və Onların Ekoloji Xüsusiyyətləri

**A.M. Əsgərov[1], L.N. Verdiyeva[2]**

[1] *AMEA Genetik Ehtiyatlar İnstitutu, Azadlıq prospekti, 155, Bakı AZ1106, Azərbaycan; E-mail:askerov1@mail.ru*
[2] *Gəncə Dövlət Universiteti, H.Əliyev prospekti,429, Gəncə AZ2001, Azərbaycan*

**Kiçik Qafqazı şimal-şərq hissəsində 2014-2016-cı illərdə aparılan ekspedisiyalar zamanı toplanılan herbari və deskriptor məlumatlarının təhlili nəticəsində bu region üçün yeni olan 3 növ (*Polypodium interjectum* Shivas, *Polystichum illyricum* (Borb.) Hahne, *Cystopteris anthriscifolia* Fomin), 1 növmüxtəlifliyi (*Polystichum aculeatum* var. *aristatum* (Christ) A.Askerov) və 1 yeni ekotip (*Adiantum capillus-veneris* L., "alçaqboylu- Gəncə") müəyyən edilmişdir. Məqalədə həmin bitkilərin aşkar edildiyi ərazilərin üçölçülü məkan göstəriciləri, taksonların nomenklaturası, morfo-bioloji dəyişkənliyi, nomenklatur tipləri haqda məlumat verilir.**

***Açar sözlər:*** *Kiçik Qafqaz, sistematika, areal, Adiant, Şirinkök, Cərgəvər, Qovuqluca*

## GİRİŞ

Kiçik Qafqazın şimal-şərq hissəsi (Azərbaycan daxilində) biomüxtəliflik baxımından Qafqazın zəngin regionlarından biridir. Burada Azərbaycanda rast gəlinən əksər bitkilik tiplərinə rast gəlinir. Kiçik Qafqazın florası və biomüxtəlifliyi üzrə müxtəlif tədqiqat işləri aparılıb. Ərazinin yüksək dağ bitkiliyi (Гаджиев, 1990), ali sporlu bitkiləri (Аскеров, 1977, 1983, 1990, 2001; Əsgərov, 2005, 2016) haqda əsərlər yazılmışdır. Lakin, Kiçik Qafqazın Qıjıkimilərinin sistematıkı, ekobotaniki xüsusiyyətləri hərtərəfli tədqiq edilməmişdir.

## MATERİAL VƏ METODLAR

Tədqiqatın materialı 2014-2016-cı illərdə Kiçik Qafqazın şimal-şərq hissəsində ekspedisiyalar zamanı toplanılan materiallar və AMEA-nın Botanika İnstitutunun və Genetik Ehtiyatlar institutunun Herbari fondlarında (BAK, AGRİ) saxlanılan herbari nüsxələridir. Toplanılan materiallar kameral şəraitdə təhlil edilmişdir. İşdə müqayisəli-morfoloji, sistematik, ekoloji metodlardan istifadə edilmişdir.

Nomenklatura məsələlərinin dəqiqləşdirilməsində Beynəlxalq Botanika Kodeksi (2009) və A.M.Əsgərovun "Azərbaycan florasının konspekti" kitabı (Əsgərov, 2011) əsas götürulmüşdür Makrotaksonlar qıjıkimilərin təsnifatına dair bəzi mühüm mənbələr əsasında dəqiqləşdirilmişdir (Pichi-Ser-molli, 1977; Smith et al., 2006; Maarten et al., 2011). Tədqiqat ərazisində ekoloji parametrlərin əldə olun-masında Diva-Gis sistemindən istifadə olunmuşdur. Hipsometrik hündürlük və areal koordinantları Garmin eTex 20 modelli GPS-lə ölçülmüşdür

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Kiçik Qafqazın şimal-şərq hissəsi, coğrafi anlamda Kiçik Qafqazın şimal-şərq yamacı adlanan ərazini (Müseyibov, 1998; Azərbaycanın Milli atlası, 2014) əhatə edir və əsasən "Azərbaycanın botaniki-coğrafi rayonlaşma" sxemində (Прилипко, 1950) "Kiçik Qafqaz şimali" rayonu ərazisində yerləşir. Lakin, sonuncu rayonlaşmada "KQ şim."-in cənub sərhəddi bir qədər cənubdan aparılmış və qismən Kiçik Qafqazın mərkəzi hissəsini də əhatə etmişdir

Bizim tədqiqat ərazisi şimaldan Kür düzünü (Kür depresiyasını) əhatə edən yovşanlı, efemerli-yovşanlı, ağotlu-yovşanlı, gəngizli-yovşanlı, səhra və yarımsəhra bitkilik formasiyaları ilə səciyyələnən 400-500 metr hündürlüyə qədər olan ərazilərlə sərhədlənir. Şərqdən Samux və Goranboy inzibati rayonlarının sərhədlərini əhatə etməklə Murovdağ silsiləsinə qədər uzanır, cənub və cənub-qərbdən Murovdağ və Şahdağ silsilələri ilə əhatələnir; qərbdən isə Şahdağ silsiləsindən Kür çayının Azərbaycan ərazisinə daxil olan yerinə qədər olan ərazilərdə Ermənistanla sərhədlənir.

Aşağıda 2014-2016-cı illərdə tədqiqat ərazisindən toplanılan materialların (cədvəl) təhlili nəticəsində Kiçik Qafqazın şimal-şərq hissəsi üçün ilk dəfə aşkar edilən 3 növün, 1 növmüxtəlifliyinin və 1 yeni ekotipin morfoloji və areoloji xüsusiyyətləri haqda məlumat verilir.

**Cədvəl.** Tədqiqat ərazisindən toplanılan növlərin koordinantları və ekoloji göstəriciləri.

| Toplanma yeri və tarixi | Növlərin adı | Yağıntının miqdarı (mm) | Temperatur (°C) | | | Coğrafi enlik və uzunluq, hündürlük (m) | Su rejimi | Yamacın cəhəti | Əldəetmə mənbəyi | Ana süxur | Relyef | Torpağın mexaniki tərkibi | Toplanma ərazisinin sahəsi (m²) |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | $T_{min1}$ | $T_{max7}$ | $T_{oi}$ | | | | | | | | |
| Gəncə, Daşkəsən, Turşsu ətrafi 23. 06. 2015 | *Adiantum capillus-veneris* | 544 | 4,7 | 15,9 | 5,6 | N 40°30.594' E 46°20.494' H 1086 | FR | SE | PA, RS, GR | B | O 5 | SA, LO, GR, SC | 5 |
| Gəncə, Hacıkənd, 23. 06. 2015 | *Cystopteris anthriscifolia* | 544 | 4,7 | 15,9 | 5,6 | N40°30.594' E 46°20 494' H 1086 | FR | SE | PA, RS, GR | B | O 5 | SA, LO, GR, SC | 5 |
| Tovuz, Əsrik 24. 06. 2015 | *Polypodium interjectum* | 554 | 5,7 | 14 | 4,2 | N 40°47.462' E 45°35.636' H 1209 | FR | SE | RS, WL, WS | B, OT | O 5 | CY, GR, ST | 5 |
| Tovuz, Əsrik 24. 06. 2015 | *Polystichum aculeatum var. aristatum* | 554 | 5,7 | 14 | 4,2 | N 40°47.462' E 45°35.636' H 1209 | FR | SE | RS, WL, WS | B, OT | O 5 | CY, GR, ST | 5 |
| Tovuz, Əsrik 24. 06. 2015 | *P. illyricum* | 554 | 5,7 | 14 | 4,2 | N 40°47 462' E 45°35 636' H 1209 | FR | SE | RS, WL, WS | B, OT | O 5 | CY, GR, ST | 5 |

Növlərin topoqrafiq və iqlim göstəriciləri üzrə (yağıntının miqdarı (mm); *Max* və *Min* temperatur (°C) $T_{min1}$ / $T_{max7}$, orta illik temperatur (°C) $T_{oi}$, toplanma yerlərinə dair ekoloji məlumatlar - Coğrafi enlik və uzunluq dairələri, dəniz səviyyəsindən hündürlüyü; Su rejimi: FR sərbəst, drenajsız; Yamacın cəhəti: SE cənub-şərq; Əldəetmə mənbəyi: PA-otlaq, RS-yolun kənarı, GR çəmən, WL-meşə zolağı və ya kənarı, WS çaykənarı, vadi, Ana süxur: B qarışıq, OT digər; Relyef: O5 dağətəyi 16 30%; Torpağın mexaniki tərkibi: SA qumlu, LO - gillicəli, GR çınqıllı, SC qumlu-gillicəli, CY-giltorpaqlı, ST-daşlıqlı; Toplanma ərazisinin sahəsi 5m

**Fəsilə Şirinkök qıjılar *Polypodiaceae* Bercht. et J. Presl**

**Cins Şirinkök *Polypodium* L.**

**1. *P. interjectum* Shivas** 1961, Journ. Linn. Soc., Bot. 58: 29; Valentine, 1964, Fl. Europ. 1:23; A. Бобр. 1974, Фл. евр. ч. СССР, 1:96; А.Аскеров 1977, Бот. журн. 62:1029.; Кудряшова 2003, Консп. Фл. Кавк. 1:156. *P. vulgare* subsp. *prionoides* (Aschers.) Rothm. 1929, Mitt. Thür. Bot. Ver., N. F., 38:106. *P. vulgare* f. *prionoides* Aschers. 1896, in Aschers. u. Graebn. Syn. Mitteleurop. Fl. 1:94. *P. vulgare* f. *attenuatum* Milde, 1867, Fil. Eur. Atl.: 92; Рзазаде 1950, Фл. Аз. 1 : 40. *P. serratum* auct. non Saut. : Фомин 1934, Фл. СССР, 1: 89, p.p. - Aralıq ş.

Avropadan (Şotlandiya) təsvir olunub.

**Typus:** "St. Cyrus, Kincandineshire, Scotland".

Kökümsovu qəhvəyi rəngli pulcuqlarla örtüləndir. Yarpaqları uzunsov lansetşəkilli, seqmentləri kənarı boyu mişar dişcikli, damarlanması 2-3 qat dixotomik budaqlanandır. Sorusları oval və ya ellipsşəkilli olub, örtüksüzdür. Sporangi həlqəsi hüceyrələri 10-20 saylıdır. Sporu paxlaşəkillidir. 2n–222 (Şək.1).

20-40 sm hündürlükdə, iyul-avqust aylarında sporverən, çoxillik, çox vaxt epifit formalarda rast gəlinən, mezofil meşə bitkisidir (əsasən fıstıq-vələs meşə formasiyası).

Avropa-Aralıq dənizi areal tipinə aid bu növün Azərbaycanda (Talışda) rast gəlinməsi ilk dəfə A.Əsgərov tərəfindən (Аскеров, 1977) göstərilmişdir. Kiçik Qafqazda ilk dəfə olaraq tərəfimiz-dən Göygöl ətrafı, Daşkəsən rayonunun Əmirvar kəndi və Tovuzun Əsrik meşə sahəsindən toplanılmışdır.



**Şəkil 1.** *Polypodium interjectum.*

Çox vaxt *Polypodium vulgare* növü ilə hibridləşir və *P. x mantoniae* (Rothm.) Shivas hibridi əmələ gətirir (Əsgərov, 2016).

**Fəsilə Ayıdöşəyilər *Dryopteridaceae* R. C.Ching.**

**Cins Cərgəvər *Polystichum* Roth, Emend. Schott.**

**1. *P. illyricum* (Borb.) Hahne** 1904, Allg. Bot. Zeıtschr. 10:103; A.Аскеров 1977, Бот. журн. 62:1027; А.Аскеров 2001, Папоротники Кавказа : 120; Кудряшова 2003, Консп. Фл. Кавк. 1:164; A.Əsgərov 2016, Azərb. bitki aləmi: 59. - *Aspidium illyricum* Borb. 1891, Oest. Zeit. 41: 354. - İlliriy c.

Avropadan təsvir olunub.

Əsas morfoloji əlamətləri *P. aculeatum* və *P. lonchitis* növləri arasında keçid xarakterlidir. Yarpaqları lansetşəkilli, 30-50 sm uzunluğunda, 4-9 sm enindədir. Saplaqları qısa, bozumtul, lansetşəkılli pulcuqlarla örtülüdür. Seqmentləri oraqşəkilli, ən aşağıdakıları üçbucaq formalı, yarpaqda damarlar bir qat çəngəlvaridir. Soruslar damarların ucunda və ya ortasında oturandır. Sporları tam yetişməyən, çox vaxt abortivdir (sterildir) 2n 123 (Şək. 2).



**Şəkil 2.** *Polystıchum illyricum.*

20-60 sm. hündürlükdə, iyul-sentyabr aylarında sporverən, orta dağ qurşağınadək kölgəli meşələrdə rast gəlinən çoxıllık, mezofit bıtkıdır.

Avropa-Qafqaz areal tipinə aid bu növ (Бобров, 1974; Кудряшова, 2003) tədqiqat ərazisindən Tovuz rayonunun Əsrik meşə sahəsindən, fıstıq-vələs meşə formasıyasından toplanılmışdır. *P. aculeatum* və *P. lonchıtis* növləri arasında təbiihibrid mənşəli növdür.

**2. *P. aculeatum* (L.) Roth** 1799, Tent. Fl. Germ. 3, 1: 79; А. Аскеров 1977, Бот. журн. 62: 1027; А.Аскеров 2001, Папоротники Кавказа: 115; Кудряшова 2003, Консп. Фл. Кавк. 1:164. – *Polypodium aculeatum* L. 1753, Sp. Pl.: 1090. *Polystichum lobatum* (Huds.) Bast 1809, Ess. Fl. Maine Loire: 367; Гроссг. 1939, Фл. Кавк., изд. 2, 1:22; Исаев 1950, Фл. Аз. 1 : 28. Tikancıqlı c.

Avropadan təsvir olunub. **Typus:** Herb. Linn. 1251/45.

Avropa mənşəli bu növ Azərbaycanda geniş yayılmışdır və onun bir neçə növmüxtəliflıyi vardır ki, onlardan daha az rast gəlinəni var. *aris-tatum* (Christ) A.Askerov hesab edılır.

***Polystichum aculeatum* var. *aristatum* (Christ)** A.Askerov 1983, Not. sist. geog. (Thi bilisi.), 39 : 6; A.Əsgərov 2016 Azərb. bitki aləmi : 60. *Aspıdium lobatum var. aristatum* Christ 1891, Schweiz Bot Ges. 1:85.

Yarpaq saplağı bozumtul rəngli, pulcuqlarla örtülü, qaidəsində 5 ötürücü topalıdır. Yarpaq ayası 2 qat ləlәkvari, qaidəsinə doğru daralan, sərt dərivaridir. İkinci sıra seqmentlərindən ən aşağıdakı (akroskopik) qalanlardan iri; seqmentləri yumşaq, tukcüklü və pərdəciklərlə örtülü, kənarları iti tikancıqlıdır. Sorusları oval, damarların orta hissəsindən yuxarıda yerləşən, örtüyü kənarında dişciklidir. Sporun perisporısı qırışıqlı, qırışıqları qısa, ensiz, hündürdür. Bəzi əlamətləri ilə Talışdan təsvir olunan *P. kadyrovii* Askerov növünə yaxındır (Şək. 3).



**Şəkil 3.** *Polystichum aculeatum* var.*aristatum.*

25-100 sm hündürlükdə, iyul-sentyabr aylarında sporverən, orta dağ qurşağınadək kölgəli meşələrdə rast gəlinən çoxillik, mezofit bitkidir (əsasən fıstıq-vələs meşə formasiyası). Tədqiqat ərazisində Tovuz rayonunun Əsrik meşə sahəsindən tərəfimizdən toplanılmışdır.

**Şöbə Polipodiumkimilər və ya Qıjılar - *Polypodiophyta (Pteridophyta* s. str.)**

**Sinif Polipodiumabənzərlər – *Polypodiopsida* (*Filicopsida*)**

**Fəsilə Qalxansızlar – *Athyriaceae* Ching** (*Athyriaceae* Alston, nom. Illeg.)

**Cins Qovuqluca – *Cystopteris* Bernh., nom. cons.**

***1. C. anthriscifolia* Fomin** 1911, Матер. Фл. Кавк. 1, 1 : 15; Фомин 1913, Птерид. Фл. Кавк. :15. - *C. fragilis* (L.) Bernh. 1805, Journ. Bot. (Götting.) 1, 2:27, p.p.; Кудряшова 2003, Консп.

Фл. Кавк. 1:162. - *C. filix-fragilis* var. *anthriscifolia* Luerss. Farnpfl. 457, f. 156; Исаев 1950, Фл. Аз. 1:19. – Sivriyarpaq q.

Avropadan təsvir olunub. **Typus:** İn collibus Europae frigidioiris.

Yarpaqları 2 dəfə ləlәkvarı bölümlü, vəzli tük cüklü, ayası və saplağı bozumtul, sonuncu sıra seqmentləri sivriuclu, damarları seqmentlərin uc hissəsində nəhayətlənəndir. Sorusu damarların hər iki tərəfində cərgəli yerləşən; örtük ovalvarı, lansetşəkilli, şişkindir. Sporun səthi (perisporisı) qırışıqlıdır. 2n – 168, 252 (Şək.4).



**Şəkil 4.** *Cystopteris anthriscifolia.*

20-40 sm hündürlükdə, iyul-avqust aylarında sporverən, meşələrdə, qaya çatlarında yayılan çoxillik, mezofit bitkidir. Tədqiqat ərazisindən Daşkəsən rayonunun Əmirvan kəndi, Tovuz rayonunun Əsrik meşəsindən, Gəncə-Daşkəsən magistral yolunun Bayan kəndı və Xoşbulaq ətrafından tərəfimizdən toplanılmışdır.

**Şöbə Polipodiumkimilər və ya Qıjılar – *Polypodiophyta (Pteridophyta* s. str.)**

**Sinif Polipodiumabənzərlər *Polypodiopsida* (*Filicopsida*)**

**Fəsilə Adiantkimilər *Adiantaceae* Newm.**

**Cins Adiant – *Adiantum* L.**

***1. A. capillus – veneris* L.** 1753, Sp. Pl. : 1096; Гроссг. 1939, Фл. Кавк., изд. 2, 1:34; Исаев 1950, Фл. Аз. 1:38; А.Бобр. 1974, Фл. евр. ч. СССР, 1:94; А.Аскеров 2001, Папоротники Кавказа : 58; Кудряшова 2003, Консп. Фл. Кавк. 1:155. – Zöhrətüklü a.

Cənubi Avropadan təsvir olunub. **Typus:** Herb. Linn. 1252/8, 9

Yarpaqları enlı uzunsov, 2-3 qat ləlәkvarikəsilən, 10-35 sm uzunluğunda, parlaq yaşıl, zərif, yarpaqcıqların kənarı örtük funksiyasını yerinə yetirəndir. Saplağı çılpaq ya da seyrək pərdəciklərlə örtülü, parlaq, qara qonurumtul rəngli, qaidəsində 1 ötürücü topalıdır. Sonuncu sıra seqmentləri pazşəkilli, nazik saplaqcıqlı, ucdan çevrilərək xətvarioval, sorusları örtəndır. Sorusları uzunsov, seqmentlərin kənarında yerləşəndir. Sporlar girdə, radial simmetrikdir. 2n – 60 (Şək.5).



**Şəkil 5.** *Adiantum capillus – veneris.*

30 sm-dək hündürlükdə (bizim aşkar etdiyimiz nüsxə - 10 sm-dək hünd.), iyun-avqust aylarında sporverən, rütubətli yerlərdə rast gəlinən çox illik, mezofit bitkidir.

Cənubi palearktik areal tipinə aid bu növün Azərbaycanda bir neçə xırda populyasiyaları Qafqaz və Talış regionlarından məlumdur (Аскеров, 2001). Tədqiqat ərazisindən ilk dəfə olaraq tərəfimizdən 2 dəfə toplanılmışdır: Gəncə şəhəri ətrafı, su quyusunun rütubətli divarlarında; təkrarən 06. 09.2015-ci ildə Daşkəsən rayonunun Əmirvar kəndi ətrafından, şəlalə ətrafı ərazidən, sucaq qayalar arasında, mamır bitkisi ilə birlikdə bu növün yeni "Alçaqboylu – Gəncə" ekotipi aşkar edilmişdir. Bu nüsxə tipik zöhrətüklü adıant nüsxələrindən ölçülərinin kiçik olması və nisbətən quraq biotoplarda rast gəlinməsi ilə seçilir.

Nadir növdür. Qismən mühafizə olunsa da, xüsusi mühafizə olunan ərazılərdən kənarda olan populyasiyaları təhlükə altındadır. Relikt, dekorativ bitkidir. Yaşıllaşdırmada, xüsusən su hovuzlarının, su fəvvarələrinin yaşıllaşdırılmasında istifadə olunur (Əsgərov, 2016).

## ƏDƏBİYYAT


**Azərbaycan Respublikasının Milli atlası** (2014) Bakı: 444 s.

**Əsgərov A.M.** (2006) Azərbaycanın ali bitkiləri. Bakı: Elm, **I:** 248 s.

**Əsgərov A.M.** (2011) Azərbaycan florasının konspekti. (Əlavə və dəyişikliklərlə, 1961-2010). Bakı: Elm, 204 s.

**Əsgərov A.M.** (2016) Azərbaycanın bitki aləmi. Bakı: TEAS PRES, 444 s.

**Müseyibov M.A.** (1998) Azərbaycanın fiziki coğ-

rafiyası. Bakı: Maarif, 400 s.

**Аскеров А.М.** (1977) *Pteridophyta* Азербайджана. *Бот. журн.*, **№7:** 1022-1030

**Аскеров А.М.** (1983) Система папоротников Кавказа. *Заметки по сист. и географ. раст.*, **вып. 39:** 3 9

**Аскеров А.М.** (1990) Отдел *Pteridophyta*. В. кн.: *Гаджиев В.Д. и др. Высокогорная растительность Малого Кавказа (в пределах Азербайджана)*. Баку: Элм, с. 23-28

**Аскеров А.М.** (2001) Папоротники Кавказа. Баку: Елм, 244 с.

**Бобров А.Е.** (1964) Сравнительный морфолого-анатомический анализ видов рода флоры СССР. *Бот. журн.*, **49 (№4):** 534-548

Бобров А.Е. (1974) Папоротникообразные. Флора европейской части СССР. Наука: Л., **1:** 68-99

**Гаджиев В.Д. и др.** Высокогорная растительность Малого Кавказа (в пределах Азербайджана). Баку, «Елм», 1990, с. 23-28

**Исаев Я.М.** (1950) *Cystopteris* Bernh., *Polystichum* Roth, *Adiantum* L. В кн.: *Флора Азербайджана*, Баку: АН АзССР, **т. 1:** 19-38

**Кудряшова Г.Л.** (2003) *Polypodiophyta. Конспект флоры Кавказа*, **т. 1:** 152-172

**Международный кодекс ботанической номенклатуры (Венский кодекс)** (2009). М.; СПБ, 282 с.

**Прилипко Л.И.** (1950) Ботанико-географические районы Азербайджана. В кн.: *Флора Азербайджана*, Баку: АН АзССР, **т.1:** 7

**Рзазаде Р.Я.** (1950) *Polypodium* L. В кн.: *Флора Азербайджана.* Баку: АН АзССР, **т. 1:** 40

**Christenhusz M., Zhang X-Ch., Schneider H.** (2011). A linear sequence of extant families and genera of lycophytes and ferns. *Phytotaxa,* **19:** 7-54

**Pichi-Sermolli, Rudolfo E.G.** (1977) *Tentamen pteridophytorum* genera in taxanomicum ordınam redigendi. *Webbia,* **31:** 315-512

**Smith A.R., Pryer K.M., Schuettpelz E., Korall P., Schneider H., Wolf P.G.** (2006) A classification for extant ferns. *Taxon,* **55(3):** 705 731.

**Новые Местонахождения Некоторых Папоротникообразных Северо-Восточной Части Малого Кавказа и Их Экологические Особенности**

**А.М. Аскеров[1], Л.Н. Вердиева[2]**

[1]*Институт генетических ресурсов НАН Азербайджана*
[2]*Гянджинский государственный университет*

В результате анализа гербарных материалов и информации дескрипторов, собранных во время экспедиции по северо восточной части Малого Кавказа нами обнаружены новые для данного региона 3 вида (*Polypodium interjectum* Shıvas, *Polystichum illyricum* (Borb.) Hahne, *Cystopteris anthriscifolia* Fomin), 1 разновидность (*Polystichum aculeatum* var. *aristatum* (Christ) A.Askerov) и 1 экотип (*Adiantum capillus veneris* L., "низкорослый Гянджа"). В статье приводятся данные GPS по местонахождению данных растений, их номенклатуре, морфо-биологической изменчивости и номенклатурных типах.

***Ключевые слова:*** *Малый Кавказ, систематика, ареал, Адиант, Многоношка, Многорядник, Пузырник.*

**New spread areas Of Some Ferns over North-East Part Of Lesser Caucasus And Their Ecological Properties**

**A.M. Asgarov[1], L.N. Verdiyeva[2]**

[1] *Institute of Genetic Recources, Azerbaijan National Academy of Sciences*
[2] *Ganja State University*

During the expeditions in 2014-2016 three new species (*Polypodium interjectum* Shivas, *Polystichum illyricum* (Borb.) Hahne, *Cystopteris anthriscifolia* Fomin), one new variety (*Polystichum aculeatum* var. *aristatum* (Christ) A.Askerov) and one new ecotype (*Adiantum capillus veneris* L., "alçaqboylu Gəncə") spread over the north-east part of Lesser Caucasus were established according to the gathered herbary and descriptor data. GPS of the area of the plant spread, nomenculature of taxa, morhpo-biological changes, and nomenclulature types were presented in the article.

***Keywords:*** *Lesser Caucasus, systematics, area, Adinath, Shirinkok, Jergever, Kovukluca*

# Sistemik Zədələyici Proseslər – Cərrahiyyənin Fundamental Nəzəriyyələrinə Ümumi Baxış: İntoksikasiyadan Günümüzdəki SİRS Və Sepsisə

**N.Y. Bayramov*, A.Ə. İbrahimova**

*Azərbaycan Tibb Universitetinin I cərrahi xəstəliklər kafedrası, S.Vurğun küç., 167, Bakı AZ1022, Azərbaycan; E-maıl: nurubay2006@yahoo.com*

**İcmal məqalədə təbabətin, xüsusən cərrahiyyənin ən önəmli fundamental və kliniki problemlərindən olan sistemik zədələnmə prosesinin təbiəti yaxud lokal zədələnmənin orqanizmin total zədələnməsinə gətirib çıxarma yolları haqda müasir ədəbiyyat mənbələri ətraflı təhlil edilmişdir. Sistemik zədələyici prosesin təbiəti ilə əlaqədar məlum olan birbaşa zədləyici (intoksikasiya və infeksiya) və auto-destriuksiya nəzəriyyələrinin (şok, stress, metabolik və SİRS-sepsis) çatışmayan cəhətləri və klinik təbabətə gətirdikləri müddəalar haqqında qısa məlumat verilmişdir. Hazırda sistemik zədələyiçi proses kimi hakim nəzəriyyə hesab edilən və əsasında immun disrequlyasiyaya duran sepsisə və diffuz iltihaba xüsusi yer verilmişdir.**

***Açar sözlər:*** *SİRS, intoksikasiya, sepsis, şok, septık şok, dısfunksıya, iltihab, sıstemik zədələyicilər*

Yerlı xarakterli patologiya hansı yolla orqanızmı bütövlükdə zədələyır" sualı təbabətin, o cümlədən cərrahiyyənin fundamental məsələsidir. Klinik təcrübə göstərir ki, əksər cərrahi və qeyri-cərrahi xəstəlıklərdə ağırlaşma və ölümlərin ən çox rast gəlınən səbəbi bılavasıtə lokal xəstəliyın özü yox, onun orqanizmdə törətdiyi ümümi zədələnmədir (təxminən 80-90%). Ona görə də, ağırlaşmlararın və letallığın qarşısını almaq üçün yerli zədələnmədən sistemık zədələnməyə aparan mexanizmləri aşkarlamaq və onlara təsir vasitələri axtarmaq tarix boyu elmi təbabətin fundamental məsələsi olmuşdur.

Orqanizm dedikdə daxili mühitinin stabilliyini qoruyan (homeostaz) və xarıcı mühıtlə substrat və informasiya mübadıləsini həyata keçirən sistem nəzərdə tutulur. Sağlam vəziyyət dedikdə daxili sabitlikdə və xarici əlaqədə harmonyanı təmin edən morfo-funksional tamlıq nəzərdə tutulur. Zədələnmə orqanizmin hər hansı bir hissəsındəkı hüceyrələrdə və ekstrasellular matriksdə baş verən morfoloji və funksional pozulma kimi qəbul edilir. Hüceyrələrin zədələnməsi morofoloji olaraq özünü nekroz, apoptoz, distrofiya ilə göstərir və hipoksik, kimyəvi, fizikı, ınfeksiyon, immun və metabolik təsirlər hüceyrə zədələnməsinin təməl səbəbləridir (Robbins. Chapter 1...). Xəstəlik zədələnmə ilə ona qarşı reaksiyaların müştərəkliyi nəticəsində meydana gələn yeni vəzıyyət kımı qiymətləndırılə bilər. Xəstəlik zədələnmənin yerindən və olçüsündən asılı olmayaraq, zədələnmə, qoruyucu-bərpa və bunların energetik-funksional təmini üçün hiperfunksiya-hipermetabolızm kimı 3 atributuv prosesin cəmındən ibarətdir (Əliyev, 2004). Xəstəlıyın gedişində 3 nəticə ola bilər: bərpa-sağalma, hissəvi bərpa və ölüm (Şəkil 1).

Bırinci halda orqanizmin bərpa prosesləri morfoloji və funksional zədələnməni tam bərpa edir, hıperfunksiya aradan qalxır və orqanizm əvvəlki sağlam vəziyyətinə qayıdır. Hissəvi bərpada, orqanizm əvvəlkı homeostazını bərpa edir, lakin yerli xarakterli deffektlər qalır (əlillik). Üçüncü halda isə zədələnmə əksər orqan və sistemlərin yetməzliyinə və ölümə səbəb olur. Multiorqan yetməzliyinin (MOY) meydana gəlməsinin iki prinsipal mexanizmi ola bilər. Bırıncılı MOY adlanan bırbaşa varıantda, zədələnmə o qədər sürətli və geniş olur ki, qoruyucu və kompensator reaksiyalar ortaya çıxmağa macal tapmadan, əksər orqanlar birbaşa olaraq ağır dərəcədə zədələnir. Buna mısal olaraq həyatla uyuşmayan böyük zədələnmələri, zəhərlənmə və total hıpoksiyanı (asfiksiya, ani massiv qanaxmalar, ürək dayanması) göstərmək olar. İkıncili MOY adlanan dolayı varinatda isə, lokal zədələnməyə qarşı qoruyucu-kompenstator və energetik reaksıyaların aktiv olmasına baxmayaraq orqanizmi total zədələyən proseslər başlayır ki, bu da orqanizmin bütövlükdə zədələnməsinə, orqan və sistemlərin yetməzliyinə və olumə səbəb olur. Orqanızmin total zədələnməsinə gətırıb çıxaran bu prosesləri başqa adla "ümumı zədələyici proses" və ya "sıstemık zədələyici proses" adlandırmaq olar.

Sistemik zədələyici proseslərlə ələqadar nəzərıyyələrı mahıyyətcə ıki qrupda cəmləşdırmək olar: birbaşa zədələyicilər və disfunksiyonal zədələyicılər (autodestruksiyalar). Orqan və sistemlərdə birincili olaraq zədələnmə törədən proseslərə birbaşa zədələyicilər deyilir kı, bunlara ıntoksıkasıyanı və infeksiyanı aid etmək olar. Disfunksiyonal və ya autodestruksiya adlanan proseslər dedıkdə isə, təbi ətcə qoruyucu-kompensator funksiya daşıyan reaksiyaların tənziminin pozulması və zədələyici mexa-

nizmlərə çevrilməsi nəzərdə tutulur, yəni, "öz qoruyucusu özünü zədələyir". Autodestuksiya nəzəriyyələrinə şok, stress, metabolik və sepsis aid edilə bılər. 20-ci əsrin ortalarına qədər birbaşa zədələyici nəzəriyyələr hakim olmuş, sonrakı dövrlərdə isə autodestruksiya nəzəriyyələri ortaya çıxmışdır.

***İntoksikasiya nəzəriyyəsi.*** Bu nəzəriyyəyə görə yerli zədələnmə nəticəsində toksinlər meydana gəlir və bunlar qana keçərək orqan və sistemləri birbaşa zədələyir (Şəkil 2). Hüceyrə və toxumaları bırbaşa zədələyən maddələr toksinlər, törətdiyi total zədələnmə isə toksikoz adlanır. Xaricdən orqanizmə daxil olan ekzotoksinlərin törətdiyi toksikoz ekzotoksikoz, orqizmdə əmələ gələn toksinlərin törətdiyi total zədələnməyə endotoksikoz və ya intoksikasiya adlanır (Opal, 2010).




**Şəkil 1.** Xəstəliyin nəticələri




**Şəkil 2.** İntoksikasıya nəzəriyyəsinin sxemi




**Şəkil 3.** Klassık sepsıs nəzəriyyəsinin sxemı

Toksin axtarışları nəticəsində nekrotoksinlər, endotoksınlər, orta çəkili molekullar və s. kimi ad lar adı altında zülal, lipid və digər orqanik təbiətli maddələr "kəşf edildi". Lakin uzun illər aparılan axtarışlara baxmayaraq hüceyrələri birbaşa zədələyən spesifik endotoksin tapılmadı (Reitschel et al., 1994). Əksinə, məlum oldu kı, endotoksınlər kimi qəbul olunan maddələrin bir qismi orqanizmin me-tabilızm məhsulları, digər bir qismi sitokınlər, fermentlər, mediatorlar və reaktiv proteinlər, başqa qismi isə mikrob məhsullarıdır. Orta molekul kütləli zülalların əksəriyyətinin sitokinlər, kəskin faza proteinləri, komplement komponentləri, kinin və s. kimi iltıhabi mediatorları olduğu ortaya çıxdı. Sıdik turşusu, bilirubin və s. kimi metabolizma məhsullarının isə tokziskoz törədən səbəb yox, nəticə olduğu, hətta yüksək konsentrasiyalalarda belə toksik vəziyyəti izah edə bilmədıyi ortaya çıxdı. Bu nəzəriyyəyə əsaslanaraq meydana çıxarılan detoksikasiya üsulları da problemi həll edə bilmədi, ən yaxşı halda müvəqqəti effekt göstərdi ki, bunu da iltihabyönlü sitokinlərin qısamüddətli azalması ilə izah etmək olar (Raetz and Whitfield, 2002).

***Klassik sepsis nəzəriyyəsi.*** Bu nəzəriyyəyə görə, yerli zədələnmə bölgəsindən qana keçən bakteriyalar və onun toksinləri orqan və toxumaları birbaşa zədələyərək multiorqan yetməzliyinə səbəb olurlar (Şəkil 3).

Məlum oldu ki, əksər mikroblar və ifraz etdikləri toksinlər hüceyrələri birbaşa yolla yox, dolayı yolla, iltihab hüceyrələrini aktivləşdirərək zədə ləyırlər. Mıkroblarda olan və patogenlərə aid molekulyar patternlər (PAMP) adlanan antigenlərin leykosıtlərdəki uyğun reseptorlarla bırləşməsi leykositar aktivasyanı başladan mexanizm olduğu

ortaya çıxdı (İsayev, 2005). Güclü sitotoksik təsirə malık olan bəzi ekzotoksinlərin özü də superantıgen rolu olnayır və leykositləri aktivləşdirərək zədələnmə törədirlər. Digər tərəfdən, məlum oldu ki, lokal zədələnmə mikrobların orqanizmə daxil olması üçün qapı açsa da, sepsisdə ıştirak edən bakterıya ların əksəriyyəti ekzogen yox, normal endogen floranın nümayəndələridir. Bakterial translokasiya ilə bağırsaqlardan qan dövranına keçən mikrobların sepsisdə önəmli rol oynadığı öz təsdiqini tapdı. Üçüncüsü, məlum oldu ki, sepsis əlamətləri olan xəstələrin təxminən 40-50%-də qanda və distant toxumalarda mikrorqanizmlər tapılmır. Digər tərəfdən, travma, kəskin destruktiv pankreatit və s. kimi başlanğıcda qeyri-infeksiyon patologiyalarda rast gəlinən multiorqan yetmzəliyin mexanimini infeksiyon nəzəriyyə ilə izah etmək mümkün olmadı. Nəhayət, bəlli oldu ki, bəzi virulent ınfeksiyalar istisna olmaqla əksər mikrobların patologiya törədə bılməsi üçün mütləq şərt kimi ınkişaf mühitinın və spesifik həssaslığın olması lazımdır ki, bunlara nekrotık toxumanı, zəif immuniteti, spesifik reseptor ları və hüceyrəyə giriş qapılarını aid etmək olar. Digər tərəfdən, antibıotikoterapiya bir çox xəstələrin həyatını xilas edə bilsə də, qanda mikrob tapılan xəstələrin hamısını xilas edə bilmədi (Давыдовский, 1969). Bu və digər faktlar göstərdi ki, lokal patologiyadan multiorqan yetməzliyinə gedən yolda infeksıya birincili və aparıcı sistemik zədələnmə mexanizmi deyildir, lakin prosesə ikincili qoşularaq ağırlaşdırıcı rol oynaya bilır. Ona görə də antıbakterial terapiya hazırda ağır xəstələrin mütləq müalicələrindən biri kimi qəbul edılir.

***Şok nəzəriyyəsi.*** Şok kəskin qan dövranı yetməzliyidir, yəni orqan və toxumaların perfuziyasının kəskin azalmasıdır (hipoperfuzya) (Abbould, 1982). Hipoperfuziya adətən erkən mərhələdə hissəvi, sonrakı mərhələlərdə isə ümumi xarakter daşıyır, toxumaların hipoksik və işemiya-reperfuziya zədələnməsinə gətırıb çıxarır. Məlumdur ki, əsas funksiyalarından biri toxumalara oksigeni çatdırmaq olan qan dövranı bır biri ilə sıx əlaqəli iki sistemdən ibarətdir: təzyiq yaradaraq qanı hərəkət etdirən makrosirkulyasiya sistemi (ürək, böyük damarlar və qan), orqanların qan təchızatını tənzimləyən və hemato-histositar mübadiləni həyata keçirən mikrosirkulyasiya sistemı (Vincent and Backer, 2013). Qanın dövranını təmin edən üç əsas morfofunksional kompenentdən hər hansı birinin və ya bir neçəsinin ciddi pozulması qanı hərəkət etdirən qüvvənin - qan təzyiqinin azalmasına, bu isə toxumaların hipoperfuziyasına - şoka səbəb olur: dövr edən qan həcmının azalması (hıpovolemik şok), damarların genişlənməsi (vazodıllatasyon şok) və ürək fəaliyyətinin azalması (kardiogen şok) (Barber and Shıres, 1996). Şok prosesının kompensator adlanan erkən mərhələsində həyatı vacib orqanların (beyin, ağciyər, ürək) perfuziyasını qorumaq üçün periferik orqanlarda (dəri, mədə-bağırsaq sistemi, böyrək və əzələ) vazo-spazm baş verir (qan dövranının mərkəzləşməsi və ya subtotal hipoperfuziya) (Chien, 1967). Bu mərhələdə səbəb aradan qaldırılarsa qan dovranı bərpa oluna bilir, aradan qalxma dıqda isə dekompensasiya adlanan növbəti mərhələ başlayır. Hipoperfuziyaya məruz qalmış periferik orqanlardakı asidoz vazodilatasıyaya səbəb olur ki, bu da bir tərəfdən bu orqanlarda işemiya-reperfuziya zədələnməsinə, dıgər tərəfdən isə qan təzyıqini azalmasına və orqanizmin total hipoperfuziyasına gətirib çıxarır (Şəkil 4).

Nəticədə qüsurlu dövran meydana çıxır hipoksiya qan dövranını zəiflədir, bu isə hipoksiyanı dərinləşdirir (Kristensen, 1994). Total hipoperfuziyanın törətdiyi hiopksiya və sellular disfunksiya bir tərəfdən kapılyar keçırıciliyinin artmasına, ekstravazasiyaya və sellular ödemə səbəb olaraq qanın həcmini azaldır (plazmaitirmə), digər tərəfdən isə ürək fəaliyyətini zəifldir vəvazodilatasiya törədir. Nəticədə həm makrohemodinamıka, həm də mikro sirkulyasıya pozulur. Mıkrosırkulyasıyanın pozulması isə öz növbəsində hipoksıyanı dərinləşdirir. “Hıpoksıya hıpoperfuzıya” qüsurlu dövranı davam etdikdə həm mikrosirkulyasiyada ağır dəyişikliklər (mıkrosirkulyator tıxaclar), həm də hüceyrələrdə geriyədönməz pozulmalar meydana çıxr ki, bu da refrakter mərhələ kımi qiymətləndirilir (Annane et al., 2005).




**Şəkil 4.** Hipoperfuziya - hıpoksiya qüsurlu dövranı

Şok nəzəriyyəsi İkinci Dünya Müharibəsindən sonra meydana çıxib bir neçə onillik ərzində sistemik zədələyici proses kimi hakim nəzərıyyə olsa da (Sınger et al., 2016), bəzi elmı-praktik problemlərin həlli baxımından tam yararlı olmadı (Shankar-Hari et al., 2016). Ancaq bu nəzərıyyə təbabət elminə çox önəmli elmi-praktik “töhfələr” verdi. Birin-

cisi, fundamental təbabətdə yeni paradiqma ortaya çıxdı: qoruyucu-kompensator reakasiya davam edərsə və ya həddini aşarsa patoloji xarakter alaraq orqanizmi zədələyə bilir. Hesab edilir ki, şok əslində orqanizmin zədələnməyə qarşı həyatqurtarma reaksiyalarından biridir və erkən mərhələdə həyati vacib orqanların qan təchizatını qoruma xarakteri daşıyır. Lakin, vaxtında korreksiya olunmadıqda davam edərək patoloji prosesə çevrilir və orqanizmdə total sellular zədələnməyə gətirib çıxarır. İkincisi, şok nəzəriyyəsi klinik təbabətdə stablizasiya prinsipini və bunu təmin etmək üçün hemodinamik və respirator dəstək tədbirlərini ortaya çıxardı və inkişaf etdirdi. Hemodinamik dəstək üçün infuziyon və transfuziyon terapiyalar, kardio- və vazotoniklər və köməkçi ürək sistemləri, oksigenoterapiya, mexaniki ventilyasiya, invaziv və qeyri-invaziv monitorizasiya və s. kimi tədbirlər ortaya çıxdı (Seymour et al., 2016).

***Stress nəzəriyyəsi.*** Stress orqanizmin zədələnməyə ümumi səfərbərlik reaksiyası olub, zədələnmənin həyati təhlükəsini azaltmağa, bərpa prosesləri başlatmağa və gedişinə şərait yaratmağa xidmət edir (Теодореску, 1972). Stress reaksiyasının əsas hərəkətverici qüvvəsi neyro-endokrin aktivləşmə hesab edilir (Goldstein and David, 2007). Klassik stress nəzəriyyəsinə görə, zədələnmə nəticəsində ağrı və qanaxma kimi amillər simpatik sinir sistemini və endokrin sistemi aktivləşdirir, adrenokortikotrop, kortikosteroid, adrenalin, qlukaqon kimi stress hormonlarının artmasına, kinin-kallikrein, komplement və digər humoral sistemlərin fəllaşmasına gətirib çıxarır (Şəkil 5).

Bu neyro endokrin aktivləşmə bir tərəfdən energetik substratların moblizasıyasını (hipermetabolizm), digər tərəfdən isə həyati vacib funksiyaların artmasını (hiperfunksiya) təşkil edərək kompensator-bərpa proseslərinin gedişini təmin edir. Nəticədə, karbohidratların (glikoliz), zülalların (zülal sintezi stress faktorlarına doğru yön dəyişdirir və itkisi artır), hətta lipidlərin katobolizmi artır, hemodinamika, oksigen ehtiyacı, respirator fəaliyyət və koaqulyasiya yüksəlir. Səbəb aradan qalxarsa neyro-endokrin reaksiya sönür, hiperfunksiya geriliyir, bərpa və anabolik proseslər başlayır (Desborough, 2000). Lakin, stress reaksiyası davam edərsə və ya şiddəti artarsa ("həddini keçərsə") "stimulyasiya-depressiya fenomeni" ortaya çıxır - energetik və funksional rezervlər tükənir, "xaos" və ümumi zədələnmələr başlayır. Məlum oldu ki, orqanizmin cavab reaksiyasının şiddəti stimulyatorun (zədələnmənin) həcmi və müddəti ilə düz mütənasibdir və orqanizmin rezervləri zəif olduqda funksional yetməzliklər (disfunksiyalar) daha erkən ortaya çıxır (Giannoudis et al., 2006).




**Şəkil 5.** Stress nəzəriyyəsi

Stress nəzəriyyəsi sistemik zədələnmənin konkret mexanızmini ortaya çıxara bilmədi, bu zədlənmənin dolayı yolla, energetik və funksional rezervlərın tükənməsi nəticəsində meydana gələn orqan disfunksiyaları ilə bağlı olduğunu ehtimal etdirdi (şok, hıpoksıya, neyro endokrin yetməzlik, yayıl mış damardaxili laxtalanama və s.) (Weis-sman, 1990). Digər tərəfdən, anesteziya və perioperativ müalicələrlə neyro-endokrin reaksiyanın kontrol altına alınmasına və energetik təminata baxmayaraq xəstələrin hamısını sıstemik zədələnmədən xilas etmək mümkün olmadı (Goldstein et al., 2007).

Bu nəzəriyyə əsasında klinik təbəbtdə 3 prinsipal istiqamət meydana gəldi:

– stimulyasiyanı (zədələnməni) azaltma
– reaksiyanı azaltma
– rezervləri artırma

Stimulyasiyanı azaltma prinsıpınə əsaslanaraq anesteziologiya və az invaziv cərrahiyyə inkişaf etdi. Ağrı stımulyasiyasını azaltmaq üçün yerlı, regional və ümumi keyləşdirmə üsullarının təşəkkülü və bu gün də davam edən inkişafı cərrahiyyənin irəliləməsində mühüm rol oynadı (Desborough, 2000). Digər tərəfdən cərrahıyyənin təməl prinsipi "minimal zədələnmə prinsipi" ortaya çıxdı. Təbabətin əsas qanununun "zərər vermə" qanunu olduğunu nəzərə alaraq "cərrahi aqressiyanı minimuma endirmək" bugünkü cərrahiyyənin əsas prinsipi sayılır. Açıq cərrahı müdaxilələrin dəridən keçən və ya endoskopik üsullarla əvəz edilməsi, erkən bərpa proqramları (effektiv ağrıkəsicılər, drenaj və kateterlərdən minimal istifadə, erkən aktivləşdirmə və erkən qidalandırma) bu istiqamətdə atılan önəmli addımlar hesab edilə bilər (Giannoudis et al., 2006).

Orqanizmin funksional və energetik rezervlərının patoloji proseslərdə önəmlı roluna əsaslanaraq əməliyyat riskini və proqnozu məyyənləşdirmək üçün rezervləri qiymətləndirməyin əhəmiyyəti orta ya çıxdı, rezervləri artırmaq üçün əməliyyat önü hazırlıqların, xüsusən də qıdalandırmanın vacıblıyı vurğulandı ("əməliyyata yaxşı gedən, yaxşı da çıxar") (Weissman, 1990).

***Sistemik iltihabi reaksiya sindromu (SİRS) və sepsis.*** 1990-cı illərdən başlayaraq, lokal xəstəliyin törətdiyi sistemık dəyişıkliklərdə və zədələnmələrdə aparıcı mexanizmin təbiətcə iltihabi proses olduğu bildırıldı və umumi iltıhab sındromu və ya sistemik iltihabi reaksiya sindromu (SİRS) və sepsis adlanan iltihabi autodestruksiya paradiqmaları formalaşmağa başladı. Bundan sonra immun sistem, ıltıhab və iltihabi autodestruksiya çoxsaylı təd qiqatların hədəfi oldu və bir çox yeni bilıklərlə yanaşı bəzi mübahisəli məsələlər də ortaya çıxdı (Alazawi et al., 2016).

Məlumdur ki, orqanizmin antigen stabilliyini təmin edən homeostatik sistem kimı qəbul edılən immun sistemin ilkin funksiyası mıkrobları məhv etməkdən ibarətdir. Bundan başqa immun sistem orqanizmə daxil olan yad antigenləri rəddetmədə (orqan və toxuma köçürülməsi) və zədələnmiş to xumaları təmizləmədə də mühüm rol oynayır. Bu sistemin iş prinsipi yad zülalları (antigenləri) spesifik anticisımlərlə (immunoqlobulınlər, T-limfositlər) birləşdirərək aradan qaldırmadan ibarətdir. Əsas komponentləri leykositlər və immunoglobulinlər olan immun sistemin bir-biri ilə sıx əlaqəli olan iki tipi var: anadangəlmə (innat) və qazanılmış (adaptiv). İnnat sistemin mühüm xüsusiyyəti antigenlə təkrar qarşılaşdıqda immun cavabın müddətinin və intensivliyinin dəyişməməsidir (yəni immun yaddaş olmur). Neytrofil, monosit-makrofaq, eozinofil, bazofil, komplement və kəskin faza zülalları (CRP, lizosim və s) innat sistemin əsas komponentləridir. İnnat immun sistem yad antigenləri birbaşa olaraq bu hüceyrələrdəki spesifik reseptorların köməyi ilə tanıyır və məhv etmək üçün faqositoz, opsonızasıya və komplementar lizis kımı effektor mexanizmləri həyata keçirir. Adaptıv ımmun sis temin xarakterik cəhəti antıgenlə təkrar qarşılaşdıqda immun cavabın müddəti və ya intensivliyinin dəyişməsidir, yənı immun yaddaşın olmasıdır. Adaptiv sistemdə yad antigenlər antigen təqdim edən hüceyrələrdə işləmdən keçdıkdən sonra tanınır, T-limfositlərə təqdim edilir, sonra isə bunlara qarşı spesifik sıtotoksik T-limfosıtlər (CD8+) və ya immunoqlobılinlər hazırlanır. Spesifik anticisimlərlə yanaşı "növbəti qarşılaşmanı" tənzimləmək üçün yaddaş və requlyator (Th1, Th2, B-limfositlər) hüceyrələr də hazırlanır. Bu sistem antigeni məhv etmək üçün sitotoksikoz, antigen blokadası və faqositoz kimi effektor mexanizmlərdən istifadə edir (Şəkil 6).




**Şəkil 6.** Adaptıv immun cavab




**Şəkil 7.** İnnat immun cavab

Prinsipal fərqlərinə baxmayaraq innat və adaptiv immun sistemlər arasında sıx əlaqə vardır. Adaptiv sistem antigeni tanımaq və məhv etmək üçün innat sistemin komponentləri olan dentritik hüceyrələrdən, monositlərdən istifadə edə bilir. Digər tərəfdən innat sistem aktivləşdikdə hüceyrələrdəki antigen ekspressiyasını artıraraq adaptiv sistemi də aktivlşdirə bilir.

İltihab innat immun sistemin zədələyiciyə (mikroblar) və zədələnməyə qarşı ən effektiv reaksiyası olub, aşağıdakı 3 bioloji "vəzifəni" yerinə yetirir:

- zədələyicini məhv etmək və ya məhdudlamaq;
- zədələnmiş bölgəni nekrozdan təmizləyərək bərpaya hazırlamaq;
- bərpa proseslərinə təkan vermək.

Zədələnmənin növündən və yerindən asılı olmayaraq iltihabi reaksiya eyni ardıcıllıq və qanunauyğunluqla gedir: **zədələnmə və/və ya zədələyici → leykositlərin aktivləşməsi → sitokin və mediator ifrazı → humoral, damar, toxuma və ümumi dəyişikliklər** (hemostaz, vazodilatasiya, keçiriciliyin artması, ödem, nekroliz, sellular disfunksiya və s.). Hesab edilir ki, mikrob və ya zədələnmiş toxuma mənşəli olan və molekulyar patternlər (matrikslər) adlanan maddələrin leykisotlərdəki (xüsusən, neytrofillərdə və makrofaqlardakı) pattern tanıyan reseptorlarla birləşməsi leykositlərin aktivlşməsinə səbəb olur (Şəkil 7).

Bakteriyalara aid molekulyar patternlərə (BAMP) pepdidoglikanlar, lipopolisaxarid (endotoksin), beta-galaktin, microbial DNT və RNT-lər və s. çoxsaylı maddələr aid edilir. Zədələnmə nəticəsində hüceyrələrdən kənara çıxan və dağılmaya aid molekulyar patternlər (DAMP) və ya alarminlər adlanan madddələrin istilik şoku proteinləri, HMG, histonlar, mitoxondrial DNT, nukleopepdidlər və s. kimi çoxsaylı nümayəndələri var. Əsasən makrofaqlarda və neytrofillərdə yerləşən çoxsaylı pattern tanıyan reseptorların (PTR) qarmağa bənzər (toll-like, TLR), düyünəbənzər (node-like, NLR), C-tip lektin (CLR) və s. nümayəndələri məlumdur. DAMP və ya BAMP ların reseptorlarla, xüsusən də monositlərdə daha çox rast gəlinən TLR4 ilə birləşməsi hüceyrədaxili siqnal sistemini işə salaraq transkripsional faktorları (NF-betta, AP1, IRF3, ERK1/2 və s.) aktivləşdirir ki, bunlar da həm iltihabyönlü (İL-1, İL-6, TNF-alfa, İNF-1 və s), həm də iltihabəleyhinə (İL-10, TGF-beta, PGE2) sitokinlərin və mediatorların, hətta əlavə DAMP-ların ifrazına səbəb olurlar.

Bu ilkin sitokin ifrazı toxumada və orqanizmdə 3 qrup prosesin başlanmasına gətirib çıxarır. Bir tərəfdən, iltihabyönlü sitokinlər və yeni DAMP-lar iltihab prosesini başladır: endotel aktivləşir, adheziv molekkullar ekspressiya olunur, bölgəyə yeni leykositlər cəlb olunur, leykositlər aktivləşir, toxuma leylkositar hücuma məruz qalır (reaktiv oksigen radikalları və peroksid zədələnməsi, leykositar enzimlər və sellular-ekstrasellular zədələnmə, faqositoz və s.), mikrosirkulyasiya və koaqulyasiya dəyişiklikləri ortaya çıxır. Digər tərəfdən qan keçən sitokinlər (TNF-alfa, İL-6, qranulosit-monosit böyümə faktoru və s) iltahabın gedişini təmin etmək üçün sümük iliyini, qan dövranını, kəskin faza protein sintezini və energetik sistemləri aktivləşdirirlər.

Digər tərəfdən isə, makrofaqlardan ifraz olunan İL-10, transformasiyaedıci böyümə faktoru (TGF-beta), prostaqlandin E2 və s. faktorlar immunosupressiyanı başladır (sitokin ifrazı azlır, Th2 lımfositlər artır, Th1 azalır, limfositar apoptoz başlayır və s).




**Şəkil 8.** İltihabyönlü və iltihabəlehinə reaksiyaların tənzimlənməsində fazalaşma (tam xəttlər) və balanslaşma konsepsıyaları (qırıq xəttlər)




**Şəkil 9.** Müasir SİRS və sepsis nəzəriyyəsinin sxemi

Kompensator əks-iltihabi reaksiya (KƏİRS) adlanan bu immunosupressiya iltıhabi prosesın "həddini aşmasının" qarşısını alır və söndürür. Hesab edilir ki, monosit/makrofaqlar immun cavabın təşkilində və tənzimlənməsində (həm iltihabin, həm də immunosupressıyanın başlanmasında, davam etməsində və sönməsində) mərkəzi rol olynayır (Гостишев и др., 1992).

Zədələnmə və bakterial invaziyaya qarşı immun cavab reaksiyalarının tənzimlənməsi ılə əlaqədar iki konsepsiya var: fazalaşma və balanslaşma konsepiyaları (Şəkıl 8).

Fazalaşma konsepsiyasına görə, əvvəl stimulyasiya (ıltıhab) başlayır və bunun ardınca meydana gələn supressıya iltihabi söndürür. Balanslaşma konsepsiyasına görə isə, iltihabi və əks-iltihabi proseslər parallel başlayır, nəticə bu ikı prosesdən hansının yüksək olmasına uyğun olaraq iltihab və ya ımmunosupressiya şəkilində ortaya çıxır.

Hazırki hakim nəzəriyyəyə görə, local zədələnmənin törətdiyi sistemik dəyişikliklərdə və zədələnmələrdə immun sistemin SİRS (sistemik iltıhabi reaksiya sindromu) və sepsis adlandılan iltihabi reaksiyaları mühüm rol oynayır. SİRS innat immun sistemin zədələnməyə və zədələyiciyə qarşı həyata keçırdiyi mudafiə xarakterli sistemik reaksiyası, sepsis isə immun sistemin disfunksiyası nəticəsində meydana gələn orqan zədələnəməsi kimı qəbul olunur (autodestruksiya). Bu nəzəriyyəyə görə, SİRS reaskısysının destruktıv xarakterli sepsisə çevrilməsinin başlıca səbəbi tənzimlənmədə olan pozulmadır disreqlyasiyadır (Şəkil 9). İltihab immunosupressıya tarazlığının polzulma mexanizmi dəqiq məlum olmasa da, ehtimal olunan iki konsepsıya var: ikinci zərbə və əks-ıltihabi konsepsiyalar.

İkinci zərbə konsepsiyasına görə iltihabı prosesin gedişi vaxtı əlavə zədələnmə meydana çıxarsa (məsələn, infeksiya, travma, hipovolemiya, şok və s.) immun sistemin normal SİRS reaksiyası pozulur və destruktiv xarakter alır.

İmmun disreqlyasiyanın baş verməsi ilə əlaqədar ikinci konsepsiyaya görə əks-iltihabı reaksiya adekvat olarsa SİRS-in qarşısını ala bilir, lakin həm azlığı, həm də çoxluğu SİRS-in destruktiv formaya keçməsinə gətirib çıxara bilir. Məsələn, sirrotik xəstələrdə sepsisin tez baş verməsi və ağır getməsinin səbəbi kimi əks-iltihabi faktorların zəifliyi göstərilir.

SİRS sepsis nəzəriyyəsi sistemik zədələyici kimi orqanizmdə baş verən bir çox dəyişiklikləri izah edə bılsə də, bəzı məsələlərın həllındə yetərsiz qalmaqdadır. Xüsusən, təbiətcə adaptiv xarakter daşıyan bu reaksiyanın autodesruksıyaya keçməsinin dəqiq mexanizmləri məlum deyil. İnfeksiyanın qoşulmasının bu prosesdə önəmli rol oynadığı bildirlısə də, infeksiya qoşulmayan hallarda hansı mexanizmlərin rol oynadığı da dəqəq bilinmur. Digər tərəfdən, sitokinemiya və disrequlyasiya prinsipınə əsaslanaraq tətbiq edilən çoxsaylı sitokin və antisitokin müalicələri, iltihabəlehinə tədbirlər sepsisin gedişində ciddi fayda verməmişdir. Bu günə qədər sepsisə yönəlmiş spesifik müalicə yoxdur və tədbirlər klassik olaraq səbəbın aradan qaldırılması və orqan dəstəyi üzərində qurulur. Bu faktlar nəzəriyyənin hələlik mükəmməl olmadığını və yeni yanaşma və biliklərə ehtiyac olduğunu göstərir.

SİRS-sepsis nəzəriyyəsi sistemik zədələyici proses kimi hələlik mukəmməl görunməsə də fundamental və klinik təbabətə bir çox faydalar gətirdı.

SİRS-sepsıs nəzərıyyəsinin fundamental təbabətə gətirdiyi paradiqmalardan biri stimulyasiya-supressiya ("təsir əks təsir yaradır") ideyasıdır. Şok və stress nəzərıyyələrındəkı stımulyasiya-tükənmə (kompensasiya-dekompensasiya) prinsipindən fərqlı olaraq SİRS nəzərıyysındə fəaliyyətin azalması "tükənmə" nəticəsində yox, aktivləşməyə əks olan prosesin başlanması ilə əlaqədardır: ımmun sistemin aktivləşməsi (iltihab) ilə suprressiv mexanizmlər (əks-iltihabi) işə düşür və iltihab sönür. Fazalı və ya paralel gedən bu iki əks proses bir-birini tarazlayır, "çərçıvədən çıxmanın" qarşısını alır, başqa sözlə sistem öz-özünü tənzimləyir. Bu prinsip laxtalanma sistemində də var (laxtalanma-əkslaxtalanma) və ümümilikdə insan düşüncəsindəki dualizm prinsipi ilə səsləşir. Digər bir paradiqma isə, tənzımlənmənin pozulduqda zərərli prosesə - autodestruksiyaya çevrilməsidir ki, bu da laxtalanma ilə yanaşı oksidatıv stress və digər sistemlərdə də özünü göstərməkdədir (Marshall et al., 1995).

SİRS sepsis nəzəriyyəsinin təbəbətə gətırdiyi önəmlı prinsıplərdən biri də odur kı, orqan disfunksiyaları olan bütün xəstələrdə sepisisi və infeksiyanı ön planda tutmaq lazımdır. SİRS-sepsis nəzərıyyəsı çərçivəsində klınik təbabətdə bir neçə yeni anlayışlar meydana çıxdı ki, bunlara, SİRS, sepsıs, septik şok, orqan difunksiyaları aid edilə bilər.

**SİRS** infeksiyaya və ya zədələnməyə qarşı sistemik iltıhabi reaksiyası olub, adaptiv-qoruyucu xarakterli hesab edilır. Klinık olaraq 4 kriterıyadan ikisi varsa SİRS diaqnozu qoyulur (temperatur >38 ° və ya <36°C, taxikardiya >90 vuğu/dəq, taxipnoe >20 və ya. Pa CO2 < 43 kPa, leykosıtoz >$12x10^9$/l, və ya leykopeniya <$4x10^9$/l).

Əvvəllər infeksiya ilə birlıkdə SİRS olduqda **sepsis** adlandırılırdı (Neviere et al., 2005). Son illər isə sepsis destruktiv proses kımi qəbul olunur və infeksiyaya qarşı immun reaksiyanın diserqulyasiyası nətıcəsində meydana gələn həyatı təhlükəli orqan disfunksiyasına deyilir. Başqa sözlə, sepsis elə vəziyyətdir ki, infeksiyaya qarşı reaskiya orqanızmın özünü zədələyır. Klınik olaraq sepsıs diaqnozunu qoymaq üçün iki kriteriya olmalıdır: şubhəli və ya təsdiqlənmiş infeksiya ocağı və həyati təhlükəli orqan disfunk-siyası. Orqan disfunksiyası ilkin olaraq qısa-SOFA şkalası ılə qiymətləndırılə bılər (sistolik təzyiq 100 mm Hg-dən az, şüur dəyişikliyi və ya Glasgow-13-dən az, tənəffüs sayı 22-dən çox), sonra isə SOFA şkalası ılə dəqiqiləşdirılır: hər ıkı şkala ilə bal 2 dən çox artarsa disfunk siya qəbul edilır kı, bu letallığı 10% artırır (Vincent et al., 2016).

**Septik şok** sepsisın ağır formalarından birıdir. Əvvəlki təriflərdə septik şok dedikdə hemodinamik yetməzlik və infuziyanın effekti ön olanda tutulurdu və ınfuziyon terapiyaya baxmayaraq arterıal təzyiqin və hipoperfuziyanın düzəlməməsi septik şok adlandırılırdı. Hazırkı təriflərdə ısə hemodınamıka və infuzıya ilə yanaşı sellular dısfunskiya, vazopressor tətbiqi və letallığa təsır də nəzrə alınaraq aşağıdakı kımı ıfadə edilir: septik şok sepsis nətıcəsində meydana gələn və letallığı artıran ağır dərəcəlı sirkulyator (hıpoperfuziya) və sellular-metabolik disfunksiyadır. Hazırda septik şok diaqnozu aşağıdakı kriterıyalar əsasında qoyulur: sepsıs əlamətləri ilə yanaşı infuziyaya cavab verməyən, vazopressor gərəkdirən hipotenziya və hiperlaktatemiya: orta arterial təzyiqi 65 mm Hg st yüksəkdə və laktatı 2 mmol/l-dən aşağı saxlamaq üçün vazopres-sor tətbiqi (letallıq 40%) (American College ..., 1992).

**MODS -multi orqan disfunksiya sindromu** 2 və daha çox orqan və sistemdə baş verən disfunksiyaya deyilir. Disfunksiya termini orqan və ya sistemın əsas funksiyasının azalması, hemostazı təmin edə bilməməsi və müdaxilə edilməsi mənasında işlədilir. Hazırda dısfunksıya geriyə dönə bılən funksional pozulma kimi qıymətləndırılır, onun ağrı formaları ısə yetməzlik adlandılır (Levy et al., 2003). MODS adətən sepsisn nəticəsidir və müalicə olunmazsa letallığa səbəb ola bilir. Disfunksiyanın dərəcəsini müəyyənləşdırmək üçün çoxsaylı şkalalar var və sepsisdə özünü ən çox doğruldan SOFA klassifikasiyasıdır.

SİRS-sepsis nəzəriyyəsinin klinik təbabətə gətirdıyı önəmli faydalardan bırı də ağırlq dərəcəsinin təyin etmək üçün ən mühüm göstəricinin orqan və sistem disfunklsıyası olduğunu vurğulanmasıdır (Le Gall et al., 1996). Buna əsaslanaraq SOFA, qısa-SOFA, APACHE, Marshall, Glasgow və s/ kimi orqan dısfunksiyalarına əsaslanan şkalalar ortaya çıxdı.

## YEKUN

Sistemik zədələyici prosesin təbiəti ilə əlaqədar klinik əhəmiyyətli nəzəriyyələri və konsepsiyaları prinsipal olaraq iki qrupda cəmləşdirmək olar. Orqan və sıstemlərdə bırbaşa yolla zədəlnmə törətmə prinsipinə əsaslanan birinci qrupa intoksikasiya və infeksıya nəzəriyyələri aıd edilə bılər. Disfunksiya və ya autodestruksiya adlanan və başlanğıcda qoruyucu-kompensator funksiyası daşıyan reaksiyaların müəyyən səbəblərdən dəyişərək zədələyicı prosesə çevrilməsinə əsaslanan ikinci qrupa isə şok, stress, metabolik və SIRS-sepsis nəzəriyyələrini aıd etmək olar. 20 cı əsrin ortalarına qədər ki dövrdə bırbaşa zədələyicı nəzəriyyələr, sonrakı dövrlərdə isə autodestruksiya nəzəriyyələri hakim olmuşdur. Bu nəzəriyyələrın əksəriyyəti sistemik zədələnməni tam izah edə bilmədi, lakin bunlara

əsaslanaraq müasir cərrahiyyənin, anesteziologiyanın və reanimasiyanın təməlını təşkil edən bir neçə fundamental və klinik müddəalar ortaya çıxdı. İntoksıkasıya nəzəriyyəsi sistemik zədələnmədə humoral faktorların önəmli rol oynadığını göstərıdi və buna əsaslanaraq detoksikasiya üsulları meydana çıxdı. Sistemik zədələnmənin mexanimini qana keçən bakteriyalar və onun toksinlərinin birbaşa təsiri ilə izah edən klassık sepsıs nəzərıyyəsinə əsaslanaraq antibiotikoterapiya, aseptika, antiseptika və mənbəyə nəzarət prınsıpləri və tədbırləri ortaya çıxdı. Təməlində hipoperfuziya bağlı hipoksik və işemik-reperfuziya zədələnməsi duran şok nəzəriyysinə əsaslanaraq stablizasiya prinsipi (ilk növbədə orqanzimin oksıgenasiyasını təmin etmək) formalaşdı, hemodinamik və respirator dəstək tədbirləri inkişaf etdi: infuziyon və transfuziyon terapiyalar, kardio- və vazotonıklər, köməkçi ürək sistemləri, oksigenoterapiya, mexaniki ventilyasiya, invaziv və qeyri-invaziv monitorizasiya və s. "Davamlı və şiddətli neyroendokrin stimulyasiya şiddətli reaksiyaya və erkən tükənməyə səbəb olur" ideyasına əsaslanan stress nəzərıyyəsinə əsaslanılarq 3 elmi-praktık istiqamət ınkişaf etdi: stimulyasıyanı azalt ma (keyləşdırmə, azinvazıv cərrahıyyə), reaksiyanı azaltma (neyroendokrin blok və intensiv terapiya), rezervləri artırma (perıoperatıv hazırlıq və qıdalandırma). Son 25 ildə hakim olan SİRS-sepsis nəzərıyyəsinə görə, sıstemik zədələnmənin əsasında zədələnməyə və ya zədələyiciyə qarşı immun cavabın dısrequlyasiyası nəticəsində baş verən iltihabı autodestruksiya durur. SİRS-sepsis nəzəriyyəsi əvvəlki nəzəriyyələrdən gələn prinsıpləri dəstəkləməklə yanaşı, ikinci zərbədən qoruma prinsipini, sepsis və septik şokun yeni anlamını gətirdi. Lakin, immun dısrequlyasıyanın korreksıyası və diffuz ıltıhabın aradan qaldırılması üçün spesifik tədbirlər hələki ortaya çıxmamışdır və bu sahədə fundomental və klinik tədqiqatlara böyük ehtiyac vardır.

## ƏDƏBİYYAT


**Əliyev S.** (2004) Patofizilologiya. Bakı: Azərbaycan nəşriyyatı, 704 *s*

**İsayev H.B.** (2016) Cərrahi xəstəliklərin patofiziologiyası. Bakı: Müəllim, 272 s.

**Гостишев В.К., Байрамов Н.Ю., Шкроб Л.О.** (1992) Закономерности реагирования иммунной системы больных с хронической гнойной инфекцией на лазерноеоблучение крови. *1-ый сьезд Иммунологов и Аллергологов Азербайджана*. Баку: с. 84 86.

**Давыдовский И.В.** (1969) Общая патология человека. М.: Медицина, с.177-183.

**Теодореску Э.И.** (1972) Общая хирургическая агрессология. Бухарест: Медиздат, с. 51-426

**Abboud F.M.** (1982) Pathophysiology of hypotension and shock. In· *The Heart*. New York: p. 452.

**Alazawi W., Pirmadjid N., Lahiri R.** (2016) Inflammatory and ımmune responses to surgery and their clınical impact. *Annals of Surgery*, **264(1):** 7380

American college of chest physıcian's socıety of critical care medicine consensus conference. definitions for sepsis and organ failure and guıdelınes for the use of innovative therapies in sepsis (1992) *Crit Care Med*., **20:** 864

**Annane D., Bellissant E., Cavaillon J.M.** (2005) Septic shock. *Lancet*, **365:** 63.

**Barber A.E., Shires G.T.** (1996) Cell damage after shock. *New Horiz*., **4:** 161.

**Chien S.** (1967) Role of the sympathetic nervous system in hemorrhage. *Physıol. Rev.*, **47:** 214.

**Desborough J.P.** (2000), The stress response to trauma and surgery. *Brıtısh journal of anaesthesia*, **85 (1):** 109-117

**Giannoudis P., Dinopoulos H., Chalidis B., Hall G.** (2006) Surgical stress response. *Injury*, **37 (Suppl 5):** S3-9.

**Goldstein D.S., Kopin I.J.** (2007) Evolution of concepts of stress . *The International Journal on the Biology of Stress*, **10 (2):** 109–120.

**Kristensen S.R.** (1994) Mechanisms of cell damage and enzyme release. *Dan. Med. Bull.*, **41:** 423.

**Le Gall J., Klar J., Lemeshow S. et al.** (1996) The logistic organ dysfunction system. A new way to assess organ dysfunction in the intensıve care unit. *ICU Scoring Group. JAMA*, **276:** 802.

**Levy M.M., Fink M.P., Marshall J.C. et al.** (2003) SCCM/ESICM/ACCP ATS/SIS International Sepsis Definitions Conference. *Crit. Care Med.*, **31:** 1250.

**Marshall J.C., Cook D.J, Christou N.V. et al.** (1995) Multıple organ dysfunction score: a reliable descriptor of a complex clinical outcome. *Crıt. Care Med.*, **23:** 1638.

**Neviere R., Manaker S., Sexton S.M., Finlay G.** (2014) Pathophysiology of sepsis; May 2014.

**Robbins.** Chapter 1: Cell Injury & Death (http: /www pathologyexpert.com).

**Opal S.M.** (2010) Endotoxins and other sepsis triggers. *Contrıb Nephrol. Contrıbutıons to Nephrology*, **167:** 14 24.

**Raetz C.R., Whitfield C.** (2002) Lipopolysaccha-ride endotoxins. *Annu. Rev Biochem.*. **71:** 635 700.

**Rietschel E., Kirikae T., Schade F., Mamat U.** (1994) Bacterial endotoxin: molecular relatıonships of structure to activity and function. *FASEB J.*, **8(2):** 217–225.

**Seymour C., Liu V., Iwashyna T. et al.** (2016) Assessment of clinical criteria for sepsis: for the third international consensus definitions for sepsis and septic shock (Sepsis-3). *JAMA*, **315:** 762.

**Shankar-Hari M., Phillips G., Levy M. et al.** (2016) Developing a new definition and assessing new clinical criteria for septic shock: for the third international consensus definitions for sepsis and septic shock (Sepsis-3). *JAMA*, **315:** 775.

**Singer M., Deutschman C., Seymour C. et al.** (2016) The third international consensus definitions for sepsis and septic shock (Sepsis-3). *JAMA*, **315:** 801.

**Vincent J., De Backer D.** (2013) Circulatory shock. *N. Engl. J. Med.*, **369:** 1726

**Vincent J., Moreno R., Takala J., Willatts S. et al.** (2016) The SOFA (sepsis-related organ failure assessment) score to describe organ dysfunction failure. On behalf of the working group on sepsis-related problems of the European society of intensive care medicine. *Intensive Care Med.*, **22(7):** 707 710.

**Weissman C.** (1990) The metabolic response to stress: an overview and update. *Anesthesiology*. **73 (2):** 308-327.

## Системные Повреждающие Процессы - Обзор Основных Теорий Хирургии: от Интоксикации к Текущему ССВО и Сепсису

**Н.Ю. Байрамов, А.А. Ибрагимова**

*1-я кафедра хирургических болезней Азербайджанского медицинского университета*

В обзорной статье сделан подробный анализ современных источников литературы о природе процесса системного повреждения организма или о путях, которыми локальное повреждение приводит к его общему повреждению. Эти исследования являются одними из самых важных фундаментальных и клинических проблем медицины, и в частности хирургии. Также дана подробная информация о клинически важной теории и концепциях процесса системного повреждения, исследованы ответные иммунные реакции на повреждение и повреждающие факторы Освещены проблемы, связанные с коррекцией иммунной дисрегуляции и устранением диффузного воспаления.

***Ключевые слова:*** *ССВО, интоксикация, сепсис, шок, септический шок, дисфункция, воспаление, системные повреждения*

## Systemic Damaging Processes – Overview Of Fundamental Theories of Surgery: From Intoxication to Current SIRS and Sepsis

**N.Y. Bayramov, A.A. Ibrahimova**

*I Departament of Surgical Diseases, Azerbaijan Medical University*

Literature resources about one of the most important fundamental and clinical problems of the medicine especially surgery, the nature of the systematic damage or the local damage leading to total damage of the organism, have been comprehensively analyzed in the review. The information on the direct damager (intoxication and infection) realated to the nature of the systematic damaging process and limitations of auto-destruction theory (shock, stress, metabolic and SIRS-sepsis) and pargraphs of the clinical medicine have been presented. Special attention is paid to sepsis and diffusion inflammation, which are considered to be the dominant conceptions based on immune dysregulation.

***Keywords:*** *SIRS, intoxication, sepsis, shock, septic shock, disfunction, inflammation, systemic damages*

AMEA nın Xəbərləri (biologiya və tibb elmləri), cild 72, №1, səh 121 125 (2017)

# Ağ Siçovulların Baş Beyin Strukturlarının Toxumalarında LDH və PK Fermentlərinin Fəallığının Orqanogenezdə Tətbiq Edilən Hipoksiyanın Təsir Səviyyəsindən Asılılığı

**A.M. Rəşidova*, U.F. Həşimova**

*AMEA A.İ. Qarayev adına Fiziologiya Institutu, Şərifzadə küç., 78, Bakı AZ1100, Azərbaycan;*
**E-mail: afag.rashidova @gmail.com*

**Məqalə prenatal inkişafın orqanogenez mərhələsində 5%, 10% və 12% hipoksiyanın təsirinə məruz qalmış ağ siçovulların baş beyin strukturlarında energetik mübadiləsinin LDH və PK fermentlərinin fəallığının erkən postnatal ontogenezdə və cinsi yetkinlik dövründə dəyişmə dinamikasının tədqiq etməyinə həsr olunmuşdur. Müəyyən edilmişdir ki, hər iki fermentin fəallığı hipoksiyanın təsirinə cavab olaraq etibarlı dərəcədə yüksəlir. Alınmış nəticələrin təhlili təqdim olunur.**

***Açar sözlər:*** *Laktatdehidrogenaza (LDH), piruvatkinaza (PK), ağ siçovul, prenatal hipoksiya, postnatal ontogenez, baş beyin strukturları, enerji mübadiləsi*

## GİRİŞ

Ətraf mühitin çirklənməsinin, stress və digər xoşagəlməz amillərin təsirləri ilə əlaqədar olaraq müxtəlif xəstəliklərin sayı artmaqdadır. Bu amillər sırasında hipoksiya güclü stress faktoru kimi orqanizmə, xüsusilə də, inkişaf edən orqanizm üçün xeyli təhlükəli sayılır (Граф и др., 2008; Журавин и др., 2009). Bu baxımdan, prenatal inkişaf zamanı hipoksiyanın təsirinə məruz qaldıqdan sonra onun postnatal inkişafın müxtəlif mərhələlərində fəsadlarını aşkar etmək və yarana bilən patoloji vəziyyətin qarşısını almaq vacib bir problemdir, və tibbi praktikada aktual bir məsələ kimi olaraq qalmaqdadır (Трофимова и др., 2008).

Hipoksiyanın təsiri zamanı MSS-nin energetik mübadiləsində mühüm dəyişikliklər baş verir. Məlumdur ki, oksigenin azlığı hüceyrələrdə gedən qlükozanın tam parçalanmasına (üç karbon turşuları tsiklində) imkan vermir və toxumalarda əmələ gələn piruvatı laktata çevirir. Bunun nəticəsində biokimyəvi proseslərin tənzimlənməsi pozulur. Baş beynin bir sıra enerji mübadiləsi fermentlərinin, o cümlədən qlikolitik tsiklin fermentləri olan piruvatkinazanın (PK; ATP: pyruvate phosphotransferase, EK 2.7.1.40) və laktatdehidrogenazanın (LDH; L-lactate: NAD oxidoreductase, EK 1.1.1.27) fəallığı nın kəskin prenatal hipoksiyadan sonra postnatal ontogenezin hər bir dövründə dəyişmə dinamikası enerjiasılı prosesləri pozmaqla, orqanizmi patoloji vəziyyətə gətirib çıxarır (Рашидова, 2016; Luc Pellerin and Magistretti, 2003; Mazurek et al., 2001). Bu səbəbdən, beyində enerji mübadiləsi çox yüksək səviyyədə olduğu üçün, orqanizmin fəaliyyəti ilk növbədə beynin tələblərinin təmin edilməsinə və saxlanılmasına yönəldilməlidir.

Bunları nəzərə alaraq, prenatal ontogenezin orqanogenez mərhələsində 5%, 10% və 12% hipoksiyaya məruz qalmış ağ siçovulların erkən postnatal ontogenezdə (17- və 30-günlük) və cinsi yetkinlik (90-günlük) dövründə baş beyin strukturlarının toxumalarında LDH və PK fermentlərinin fəallığının dəyişmə dinamikasının bir sıra göstəricilərindən müqayisəli aspektdə asılılığının öyrənilməsi və hipoksik stressdən əmələ gələn fəsadların dönərliliyini qiymətləndirmək bu işin əsas məqsədi olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqatlar Avropa elmi fondu və heyvanlara qarşı humanist münasibət haqqında Helsinki bəyannaməsinin tövsiyə etdikləri prinsip və normativ sənədlər əsasında 3 yaş dövrünə aid (17; 30- və 90-günlük) ağ siçovullar üzərində aparılmışdır. Boğaz lılığın orqanogenez mərhələsində hər gün 20 dəqiqə olmaqla 5 gün ərzində 5%, 10% və 12% oksigen, müvafiq olaraq 95%, 90% və 88% azotlu qaz qarışığı ilə xüsusi barokamerada hipoksiyaya məruz qalmış analardan alınmış balalar postnatal ontogenezin 17; 30 və 90 günlərinə çatdıqda dekapitasiya edilmişlər. Orbital, hissi hərəki, limbik qabıqları, hipotalamus və beyincik buz konteyneri üzərində ayrılmışdır. Baş beyin strukturlarının toxumaları 1:9 nis-bətində 0,2 M tris-HCl b. (pH 7,4); 1 mM EDTA; 0,25 M saxaroza tərkibli mühitdə homogenizasiya edilmiş və 10 dəq ərzində 1000 g rejimində K-24 markalı (Almaniya) refrijeratorlu sentrifuqada sen-trifuqalaşdırılmışdır. Alınan çökuntüdə tam dağılmamış hüceyrələr və nüvələr, toxuma qırıntıları xaric edilmişdir. Supernatant 1:20 nisbətində 0,32 M saxaroza məhlulu ilə durulaşdırılmış və təcrübələrdə istifadə olunmuşdur (Осадчая, 1999).

Kontrol-nəzarət qrupunu hipoksiyaya məruz qalmamış eyni yaşda olan heyvanlar təşkil etmişdir.

Baş beyindən differensasiya olunmuş hipotalamus, beyincık, hissı-hərəkı, orbıtal və lımbik qabıqlarının toxumalarında (Светухина, 1968; Pellegrino et al., 1979) LDH-nın və PK-nın ümumı və xüsusı fəallığı, zülalın miqdarı təyin olunmuşdur.

Pıruvatkınaza və laktatdehıdrogenaza ferment lərinin fəallığı Berqmeyer-ın spektrofotometrik üsulu ilə (Bergmeyer, 1973) 340 nm dalğa uzunluğunda, ümumi zülalın miqdarı Bredford üsulu ilə 0,01%-li G-250 Göy Kumassi brilliant məhlulunu istifadə edərək 595 nm dalğla uzunluğunda təyin olunmuşdur (Kruger, 2002).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Apardığımız təcrübələrdə orqanogenez mərhələsində 5%, 10% və 12% hıpoksiyaya məruz qalmış təcrübə heyvanlardan bala almışıq və həmın balaların beynində postnatal inkişafın 17, 30 və 90 günlərinə çatdıqda piruvatkınaza və laktatdehidrogenazanın fəallığını və zülalın miqdarının dinamikasını öyrənmışik. LDH və PK fermentlərin fəallığı hipotalamus, beyincik, hissı-hərəki, orbıtal və lımbik qabıqlarının toxumalarında təyin edilmişdir.

Qeyd etmək istərdik ki, təcrübələrə görə 10% və 12% oksigen, müvafiq olaraq 90% və 88% azotlu qaz qarışığı ılə hipoksiyaya məruz qalmış ağ siçovullar üzərində aparılan təcrübələrin nəticələrınə əsasən demək olar ki, hər bir tədqiq olunan baş beyin strukturlarında fermentlərin fəallığının göstərıcılərində hipoksiyanın faizından asılı olan ciddı fərq izlənilməmişdir. Bu səbəbdən biz siçovulları 12% hipoksiyaya məruz qoyduqdan sonra alınan nəticələrin təhlilinə üstünlük vermişik. Təcrübələrdə alınan LDH və PK fermentlərinin dəyişmə dinamıkasının göstəriciləri 2 cədvəldə öz əksini tapmışdır (Cədvəl 1 və 2).

Belə kı, 12% hipoksiyanın təsirınə məruz qalmış heyvanların baş beyin strukturlarının toxuma homogenatlarında LDH fermentinin kontrol qrup heyvanlarının ferment fəallığının göstəriciləri ilə müqayısədə əksər hallarda kəskin artması müşahidə olunur (<0,01;<0,001). Tədqiq olunan beyin strukturlarının hər birində fermentin ən yüksək göstərıcıləri postnatal inkişafın 30-cu günündə qeydə alınmışdır (<0,001).

5% hipoksiyanın təsirinə məruz qaldıqdan sonra alınan fermentin fəallığının göstəriciləri ilə müqayisədə isə 12%-lı hıpoksiyanın təsiri fərqlı olmuş və onlardan bir neçə dəfə yüksək olmuşlar (<0,01; <0,001). Lakın postnatal inkişafın 17-cı günündə orbital qabıqda və beyıncikdə alınan göstərıcilər istısna təşkil etmiş, başqa sözlə, LDH ın fəallığı aşa ğı düşmüşdür. Bu fərqı nısbətən etibarsız saymaq olar (>0,05;<0,05) və adı çəkilən baş beyin strukturlarının bu yaşa uyğun morfo-funksional xüsusıyyətləri ilə əlaqələndirmək olar (Cədvəl 1).

30- və 90-günlük siçovulların baş beyin strukturlarında LDH-ın dinamıkasında hıpoksiyanın təsır səviyyəsindən asılı olaraq və kontrol göstəricilərinə nısbətən davamlı yuksəlmə müşahıdə olunmuşdur. Yəni, hipoksiyanın səviyyədən asılı təsir effekti azaldıqca, fermentın fəallığı artırdı (<0,01;<0,001).

Eyni zamanda ıdentık modeldə PK fermentinın də fəallığının dəyişməsi aşkar olunmuş və öyrənilmişdir. Aparılan tədqıqatların nəticələrı göstərdı ki, orqanogenez mərhələsində 12% hipoksiyaya məruz qalmış heyvanların baş beyninin müxtəlif strukturlarının, dəqiqliklə desək, hipotalamus, beyincik, hissi-hərəki, orbital və limbik qabıqlarının toxumalarında PK fermentinin fəallığı dəyişilir və bu dəyişmə bir mənalı olmur.

Cədvəl 2-dən göründüyü kimi, orbital qabıqda erkən postnatal ontogenezin 17-ci günündə PK-nın xüsusi fəallığı 10-12%-li hıpoksiyanın təsirindən sonra müqayisədə həm kontrol, həm də hipoksiyanın 5%-lı təsirındən sonra artmışdır. Qeyd etmək lazımdır ki, eyni mənzərə daha qabarıq şəkildə beyincikdə izlənilmişdir burada PK nın fəallığı kontrola nis bətən 7,5 dəfə yüksək olmuş və 1,05 µM NADH/1 q təzə tox/1 dəq/1 mq zülala təşkıl etmişdır (p<0,001).

30-günlük siçovullarda orbital, hissı-hərəki, limbik qabıqlarda və hipotalamusda PK fermentinin fəallığının dınamıkasında identik mənzərə muşahıdə olunur. Fermentin fəallığının postnatal inkişafın 30-cu gunündə baş beyin strukturlarında kontrola nisbətən kəskin artmasına baxmayaraq, beyinciyin göstəricıləri istisna təşkil etmışdır burada 17-cı günün göstəricıləri ilə müqayisədə fermentin fəallığı nisbətən aşağı duşmüşdür və 5, 62 µM NADH/1 q təzə tox/1 dəq /1 mq zülala təşkil etmişdir (p<0,001). Postnatal dövrü uzandıqca isə göstəricilər kontrol səvıyyəsinə enməyi müşahidə olunmurdu.

90-günlük siçovullarda PK-nın xüsusi fəallığı strukturlarda aşağı düşmüş, hətta hissi-hərəki və limbik qabıqlarda kritik dərəcəyə çatmışdır - 1,09 µM NADH/1 q təzə tox/1 dəq /1 mq zülala və 1,6 µM NADH/1 q təzə tox/1 dəq /1 mq zülala təşkil etmişdir (p<0,001). Yəni, postnatal dövrü uzandıq ca fermentin fəallığı azalır (Cədvəl 2).

PK fermentinin fəallığının dəyişmə dinamikasını yaş qrupundan asılılığını ümumiləşdırıb qeyd etmək olar ki, 17-günlük heyvanların öyrənilən strukturlarının toxumalarında PK-nın fəallığı əsasən hər bir tədqiq olunan strukturda kontrola nisbətən təxmınən 3-15 dəfə yüksəlir. 30-günluk heyvanların öyrənilən strukturlarının toxumalarında PK-fermentinin fəallığı 17-günlük heyvanlarla müqayisədə kəskın artmış, və hətta kontrol göstəricilərınə nisbətən 1,5 7,0 dəfə yüksəlmişdir. 90 günlük heyvanla rın tədqiq olunan strukturlarının toxumalarında isə PK fermentinin fəallığı əsasən kontrola nisbətən yüksək olmuşdur (Cədvəl 2).

